Layihənin rəhbəri Azərbaycanda Vətəndaş Cəmiyyətinin İnkişafına Yardım Assosiasiyasının Prezidenti, Şamaxının Millət Vəkili **Elxan Süleymanov**

Müəllif Tarix elmləri üzrə fəlsəfə doktoru **Məhərrəm Zülfüqarlı**

Elmi redaktor Tarix elmləri doktoru, professor **Kərim Şükürov**

Redaksiya heyəti

**Fuad Babayev**
**Təranə Babayeva**
**Şahin Camalov**
**Vəli Əlibəyov**
**Dəyanət Musayev**
**Ramiz Sevdimalıyev**

Kitabda 1918-ci ilin mart–aprel aylarında Şamaxıda erməni silahlıları tərəfindən törədilmiş soyqırımdan bəhs olunur. Bakı Sovetinin yardımı ilə ermənilərin bu cinayətləri törətməkdə əsas məqsədləri təbii sərvətlərlə zəngin olan Azərbaycan ərazisində, ilk növbədə Bakı və onun ətrafında etnik təmizləmə aparmaqla bu əraziləri Sovet Rusiyasına tabe etməkdən ibarət idi.

ISBN 978-9952-8135-3-9

$\frac{470710000}{036\text{-}2011}$ qrifli nəşr

# Mündəricat

# Ön söz

90 ildən çoxdur ki, erməni diasporu beynəlxalq ictimaiyyətə birtərəfli, çox vaxt yanlış və hətta qəsdən təhrif edilmiş mənbələrdən məlumatlar verir. Bu gün bəzi ölkələrin parlamentləri və ictimaiyyəti 1915-ci il hadisələrini erməni iddiaları əsasında "soyqırım" kimi tanımış və ya tanımağa hazırlaşır.

Təəssüf ki, Türkiyə 15 il əvvələ qədər bu sahədə səssiz qalmağa üstünlük verib, bu məsələnin zaman keçdikcə ermənilər tərəfindən gündəliyə gətirilməyəcəyini güman edib. Ancaq əksinə, erməni diasporu Amerika Birləşmiş Ştatlarında və bir çox başqa ölkələrdə bu məqsədlə sanki bir şirkət kimi təşkilatlanmış, minlərlə adam yaşayışlarını təmin etmək üçün bunu özlərinə peşə seçmişdir. Erməni diasporu uydurma erməni soyqırımı iddialarını daima gündəmdə saxlayaraq bir tərəfdən dünyanın bir çox ölkələrində ermənilər arasında öz mənsubiyyətlərini qorumaq məqsədini qarşısına qoyur, digər tərəfdən Türkiyədən kompensasiya tələbini və hətta torpaq iddialarını bir təzyiq vasitəsi kimi davam etdirmək istəyir.

Erməni diasporunun 90 ildən artıqdır, yazılı və elektron mediada yaydığı birtərəfli və tamamilə obyektivlikdən uzaq məlumatlar əlbəttə ki, öz təsirini göstərib, yanlış və təhrif edilmiş iddialar tədricən bəzi ölkələrdə sanki yeganə həqiqət kimi qəbul edilməyə başlanıb.

Son illərdə Ermənistan və erməni diasporunun 1915-ci il hadisələrini çox tez-tez ictimaiyyətin və bəzi ölkələrin parlamentlərinin gündəliyinə gətirməsinin ən vacib səbəbi də budur ki, onlar 19 il əvvəl Rusiyanın ağır silahları ilə işğal etdikləri Azərbaycan ərazilərini, bir milyona yaxın Azərbaycan qaçqınını və Dağlıq Qarabağ məsələsini beləliklə, diqqətdən kənarda saxlamağa çalışırlar. Bu strategiya son dərəcə düşüncəli bir şəkildə diqqətlə

həyata keçirilir.

Şübhəsiz ki, Ermənistan və erməni diasporu xüsusilə 1918-ci ilin mart-aprel aylarında Azərbaycan türklərinə qarşı həyata keçirdikləri qətliamları və 1992-ci ildə darmadağın edilən Xocalıda əksəriyyəti qadın və uşaq olan 630 insanın qətlə yetirildiyini də gündəlikdən kənarda saxlamağa çalışır.

Beynəlxalq ictimaiyyət artıq həqiqətləri obyektiv mənbələrdən öyrənməlidir. Buna görə də Türkiyə ilə Azərbaycan bu məsələyə böyük önəm verərək təhrif edilməmiş, dəyişdirilməmiş mənbələri və müxtəlif ölkələrdəki arxiv sənədlərini əsas dillərdə nəşr edərək dünya ictimaiyyətinin obyektiv məlumatlar almasını təmin etməlidir.

Əgər Ermənistan və erməni diasporu bu günə qədər beynəlxalq ictimaiyyətə təqdim etdikləri məlumat və mənbələrin həqiqiliyinə belə inanırlarsa, Rusiya, Fransa, Almaniya, İngiltərə, ABŞ, Türkiyə, Ermənistan və Azərbaycandakı sənədlərlə, mənbələrlə və arxiv məlumatları ilə üzləşməkdən niyə çəkinir? Niyə Türkiyənin bu mənbələrin türk, erməni və beynəlxalq tarixçi-mütəxəssislərdən ibarət komissiya tərəfindən araşdırılması ilə bağlı təklifini rədd edirlər? Əgər Ermənistan və erməni diasporu ətraflı bir araşdırma nəticəsində həqiqətlərin üzə çıxmasından və beynəlxalq ictimaiyyətə bu günə qədər qəsdən səhv məlumatların verilməsi faktının aşkara çıxmasından narahat deyilsə, Türkiyənin bu təklifi niyə qəbul edilmir?

Dünyanın bir çox yerlərində eyni regionda yaşayan və ya bir-birinə qonşu olan ölkələrdə xalqlar uzun müddət müharibə etmiş, son dərəcə kədərli hadisələr baş vermişdir. Bunun ən bariz nümunəsi olaraq, Almaniya və Fransa arasında İkinci Dünya müharibəsinə qədər yüz illər boyunca davam edən müharibələr və iki xalqın çəkdiyi ağlasığmaz əziyyətləri göstərmək olar. Almaniya və Fransa, 1950-ci illərdən etibarən tarixin bu kədərli səhifələrindən dərs alaraq mehriban və hətta dostcasına qonşuluq münasibətləri yarada

biliblər. Bunun ilk şərti isə hər iki tərəfin də həqiqətləri olduğu kimi aşkara çıxarılması istəyi və gözəl qonşuluq münasibətlərinin qurulmasında təkid etmələridir.

Azərbaycan və Türkiyə ilə mehriban qonşuluq münasibətlərinin yaranması və Qafqazda sülhün bərqərar edilməsi üçün Ermənistan ilk olaraq və qeyd-şərtsiz bir çox beynəlxalq qərarlara əməl edərək, Azərbaycanın işğal etdiyi ərazilərini boşaltmalı, qaçqınlar öz evlərinə geri qayıtmalı və Dağlıq Qarabağ münaqişəsinin sülh yolu ilə həllinə "hə" deməlidir. Sülhün və yaxşı qonşuluq münasibətlərinin təmini bu ölkələrin xalqlarının xeyrinə olacaqdır. Ərazilərinin beşdə birinin işğalı və bir milyona yaxın insanın yurdundan-yuvasından didərgin düşməsi ilə Azərbaycanın barışacağını ümid etməyə heç bir ölkənin, o cümlədən Ermənistanın haqqı yoxdur.

Çar Rusiyası əsrlər boyunca müharibə vəziyyətində olduğu Osmanlı İmperiyası ilə sərhəd bölgəsində öz nəzarəti altında xristian dininin hakim olduğu bufer zona yaratmaq məqsədilə Qərbi Qafqazda erməni əhalisinin artması üçün qədimdən bəri bir siyasət həyata keçirmişdir. Erməniləri bu ərazilərə köçürdərək əhali arasındakı tarazlığı ermənilərin lehinə dəyişdirməyə çalışıblar. Bu gün həllini gözləyən Dağlıq Qarabağ münaqişəsi də bu siyasət nəticəsində yaranıb.

Məhz bu nəşr, xüsusilə 1918-ci ilin mart-aprel aylarında ermənilərin Azərbaycan türklərinə qarşı törətdikləri qətliamı aşkara çıxarmaq və beləliklə də bu vacib tarixi hadisənin bütün çılpaqlığı ilə göstərilməsinə imkan vermək məqsədini daşıyır.

*Prof.Dr. Haqqı Kəskin*
*Almaniya Parlamentinin millət vəkili və Avropa Şurası Parlament Assambleyasının üzvü (2005-2009)*

# Giriş

Azərbaycan ərazisində çar Rusiyasının müstəmləkə siyasətinə uyğun olaraq ermənilərin Şimali Azərbaycana köçürülməsi və onların əli ilə zaman–zaman 1905-1906, 1918-1920, 1948-1953, 1988 -1994 və digər illərdə yerli əhaliyə qarşı soyqırım siyasətinin həyata keçirilməsindən beynəlxalq ictimaiyyətin kifayət qədər məlumatı yoxdur. Erməni quldurlarının azərbaycanlılara qarşı törətdiyi çinayətlərin tədqiqi göstərir ki, bunlardan ən dəhşətliləri 1918–ci ilin mart–aprel aylarında Bakı, Şamaxı, Quba, İsmayıllı, Göyçay, Hacıqabul, Kürdəmir, Salyan, Lənkəran, Zəngəzur, Naxçıvan, Qarabağ, Ağstafa və s. ərazilərdə baş vermişdir. Bu cinayətləri planlı sürətdə 1918–ci ilin yanvarında rus–türk cəbhəsindən geri qayıdan və tərkibində çoxlu sayda ermənilər olan hərbi qüvvələr həyata keçirmişdir. S. Şaumyanın rəhbərlik etdiyi Bakı Sovetinin təhriki ilə yerli müsəlman əhaliyə qarşı həyata keçirilən bu soyqırımın əsas məqsədi neft və digər faydalı qazıntılarla zəngin olan Azərbaycanın, ilk növbədə isə Bakı və onun ətraf əhalisinin milli və dini tərkibini dəyişdirməklə bu əraziləri sovet Rusiyasına tabe etməkdən ibarət idi. 1918–ci il qırğınları həyata keçirildiyi dövrdə, konkret olaraq 1918–ci ilin aprelində Bakıdan Rusiyaya 94 min ton, may ayında 182 min ton, iyun ayında 466 min ton, iyul ayında isə 492 min ton neft daşınmışdı. (1)

Azərbaycan Xalq Cümhuriyyəti Nazirlər Şurası 1918–ci il iyulun 15-də müsəlman əhaliyə qarşı törədilmiş cinayətləri tədqiq etmək üçün Ələkbər bəy Xasməmmədovun rəhbərliyi altında Gəncə Dairə Məhkəməsinin üzvləri İsmayıl bəy Şahmaliyev və Andrey Fomiç Novatski, həmin məhkəmənin prokuroru Nəsrəddin bəy Səfikürdski, Nikolay Mixayloviç Mixaylov, V.Qudvillo və Mirzə Cavad Axundzadədən ibarət Fövqəladə İstintaq Komissiyası yaratmışdı. Komissiyanın topladığı sənədlər təsdiq etmişdi ki,

ermənilər Azərbaycan xalqına qarşı qabaqcadan hazırlanmış soyqırım siyasətini həyata keçirmişlər.

BMT Baş Assambleyasının 9 dekabr 1948-ci il tarixli 260 (III) saylı qətnaməsi ilə qəbul edilmiş Soyqırımı Cinayətinin Qarşısının Alınması və Cəzalandırılması Haqqında Konvensiyanın II maddəsində deyilir:

"genosid" (soyqırım–müəllif) dedikdə, hər hansı milli, etnik, irqi, yaxud dini qrupu tam və ya qismən məhv etmək məqsədilə törədilən aşağıdakı hərəkətlər başa düşülür:

a) hər cür qrupun üzvlərinin öldürülməsi;

b) bu cür qrupun üzvlərinə ağır bədən xəsarəti, yaxud əqli xətər yetirilməsi;

c) hər hansı qrup üçün qəsdən onun tam, yaxud qismən fiziki məhvini nəzərdə tutan həyat şəraiti yaradılması;

d) bu cür qrupda doğumun qarşısını almağa yönəldilmiş tədbirlərin görülməsi;

e) uşaqların zorla bir insan qrupundan alınıb başqasına verilməsi.

1918–ci ildə ermənilərin azərbaycanlılara qarşı soyqırım törətməsi faktı Fövqəladə İstintaq Komissiyası tərəfindən təsdiq edilməsinə baxmayaraq çox təəssüf ki, cinayətkarların cəzalandırılması mümkün olmamışdır. Buna 1920–ci ilin fevralında qəbul edilmiş amnistiya haqqında qanun və Sovet Rusiyası tərəfindən Azərbaycanın 27 aprel 1920–ci il tarixdə işğal edilməsi imkan verməmişdi.

İşğaldan sonra problemin obyektiv tədqiqi əvəzinə Moskvanın göstərişi ilə Azərbaycan xalqına "dostu düşmən, düşməni dost" kimi təqdim edən "26 Bakı komissarı" kimi saxta tarixi əfsanələr uydurulmuşdu. (2) Sovet dövründə azərbaycanlılara qarşı törədilmiş cinayətlərin əsas təşkilatçıları "xalq qəhrəmanları" kimi qələmə verilərək, onların şərəfinə abidələr ucaldılmışdı. (3)

Bununla yanaşı, 1918–ci ildə dinc əhalini erməni, bolşevik soyqırımından xilas etmək uğrunda canlarından keçmiş Azərbaycan və türk əsgərlərini yaddaşlardan silmək üçün geniş kampaniya aparılmış, hətta onların məzarlarının bərpasına cəhd edən şəxslər ciddi cəzalandırılmışdı. Məsələn, Şamaxı-Mərəzə arasında Acıdərə deyilən yerdə 1918–ci il iyul döyüşlərində şəhid olmuş türk zabiti, mayor İzzət Əfəndinin tənha qəbrinə münasibət deyilənləri sübut edir. Baş daşını qoyduran Şamaxı qəsəbəsi valisi 1928-ci ildə öldürülmüş, bu tənha məzar dağıdılmışdır. Sonrakı illərdə Məhəmməd və bir qədər sonra isə Babaxan Rzaxanov adlı Şamaxı sakinləri tərəfindən məzar bərpa edilmişdir. Məhz buna görə Babaxan Rzaxanov 1964–cü ildə həbs olunmuşdur. Nəhayət, 1993–ci ilin yazında qəbir təmir olunmuş, 2000-ci il mayın 10-da isə burada 1918-ci il Qafqaz hərəkatında şəhid olan 1130 qəhrəman türk əsgərininin xatirəsinə abidə ucaldılmışdır. Xalq şairi Bəxtiyar Vahabzadə "Tənha məzar", Qabil "Türkün qəbri" adlı şeirlərini həmin məzarda uyuyan türk əsgərinə ittihaf etmişlər. (4)

Azərbaycan Respublikası 18 oktyabr 1991–ci il tarixdə dövlət müstəqilliyini bərpa etdikdən sonra yenidən problemin obyektiv tədqiqi üçün şərait yaranmışdı. Ümummilli lider Heydər Əliyevin "Azərbaycanlıların soyqırımı haqqında" Fərmanının (26 mart 1998-ci il) bu işdə müstəsna rolu vardır. Fərmanda deyilir: "Azərbaycanlıların soyqırımı Bakı, Şamaxı, Quba qəzalarında, Qarabağda, Zəngəzurda, Naxçıvanda, Lənkəranda və Azərbaycanın başqa bölgələrində xüsusi qəddarlıqlarla həyata keçirilmişdir. Bu ərazilərdə dinc əhali kütləvi surətdə qətlə yetirilmiş, kəndlər yandırılmış, milli mədəniyyət abidələri dağıdılıb məhv edilmişdir... Bu hadisələrin yalnız birinə-1918-ci il mart qırğınına siyasi qiymət vermək cəhdi göstərilmişdir. Azərbaycan Xalq Cümhuriyyətinin varisi kimi Azərbaycan Respublikası bu gün onun axıra qədər həyata keçirə bilmədiyi qərarların məntiqi davamı olaraq soyqı-

rım hadisələrinə siyasi qiymət vermək borcunu tarixin hökmü kimi qəbul edir." (5)

Hazırda 1918–ci il hadisələri ilə bağlı araşdırmaları davam etdirmək üçün Azərbaycan Respublikasının Baş Prokurorluğu Fövqəladə İstintaq Komissiyasının azərbaycanlılara qarşı ermənilər tərəfindən aparılan soyqırımı ilə bağlı Azərbaycan Respublikası Milli Arxiv İdarəsində saxlanılan 3 cilddən ibarət cinayət işinin materiallarını "Soyqırımı memorial kompleksi"nin işində istifadə olunması məqsədilə bu məsələlərin araşdırılması, geniş ictimaiyyətə və beynəlxalq aləmə çatdırılması üçün Heydər Əliyev Fonduna təqdim edib.

Heydər Əliyev Fondunun "Tolerantlığın ünvanı: Azərbaycan" layihəsi çərçivəsində Şamaxıda 1918–ci ildə ermənilər tərəfindən yandırılmış Cümə məscidinin yenidənqurulması da tarixi ədalətin bərpası sahəsində görülən müsbət işlərdəndir. Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin digər tarixi abidələrlə yanaşı, Şamaxının Cümə məscidində aparılan bərpa işlərinə xüsusi diqqət verməsi tarixi ədalətin bərpasına göstərilən qayğının nümunəsidir.

Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev 31 Mart Azərbaycanlıların Soyqırımı Günü münasibətilə Azərbaycan xalqına müraciətində demişdir: "Sizi əmin edirəm ki, xalqımızın vətənpərvərliyi, birliyi və həmrəyliyi, Azərbaycan rəhbərliyinin siyasi iradəsi sayəsində qarşımıza qoyduğumuz bütün məqsədlərə, o cümlədən, ərazi bütövlüyümüzün və suverenliyimizin bərpasına, soyqırımı həyata keçirənlərin, insanlar və xalqlar arasında nifaq və düşmənçilik salanların ifşasına nail olacağıq." (6)

Müxtəlif ölkələrdə fəaliyyət göstərən diaspor təşkilatları azərbaycalılara qarşı törədilmiş cinayətlər haqqında həqiqətlərin dünyaya çatdırılmasında səmərəli fəaliyyət göstərirlər. Azərbaycan və Türk Diaspor Təşkilatları Koordinasiya Şurası-

nın illik toplantısında (Almaniya, Berlin 27 mart 2008-ci il) qəbul edilmiş Bəyanatda deyilir: "1918-ci ilin mart ayında Azərbaycanın müxtəlif bölgələrində...erməni şovinist millətçiləri tərəfindən türk xalqlarına qarşı törədilmiş soyqırımı aktları ən ağır cinayətlərdən biri kimi tarixə düşmüşdür... Hadisələr zamanı Bakı, Şamaxı, Muğan, Quba və Lənkəranda 50 min azərbaycanlı xüsusi amansızlıqla qətlə yetirilmiş, 10 minlərlə insan öz torpaqlarından qovulmuşdur. Təkcə Bakıda erməni terrorçuları tərəfindən öldürülənlərin sayı 30 minə çatmışdır. Şamaxı qəzasında 58, Qubada 122, Qarabağın dağlıq hissəsində 150, Zəngəzurda 115, İrəvan quberniyasında 211, Qars əyalətində isə 92 kənd tamamilə yerlə yeksan edilmişdir...1992-ci ilin fevralında erməni millətçiləri daha bir dəhşətli soyqırıma–Xocalı cinayətinə imza atmışlar.

İnsan Hüquqları haqqında Ümumi Bəyannamə, İnsan Hüquqlarının və Əsas Azadlıqlarının Müdafiəsi haqqında Avropa Konvensiyası, BMT Baş Məclisinin 9 dekabr 1948-ci il tarixli 260 (III) saylı qətnaməsi ilə qəbul edilmiş Soyqırımı Cinayətinin Qarşısının Alınması və Cəzalandırılması haqqında Konvensiya, Beynəlxalq Cinayət Məhkəməsinin Statusu (mad.6) və digər beynəlxalq hüquqi aktlar 31 mart və Xocalı soyqırımlarının beynəlxalq cinayət kimi tanınması üçün əsas verən hüquqi sənədlərdir.

Azərbaycan və Türk Diaspor Təşkilatlarının Koordinasiya Şurası bir daha beynəlxalq ictimaiyyətə müraciət edərək, erməni millətçilərinin türk xalqlarına, xüsusilə də azərbaycanlılara qarşı törətdikləri terror və soyqırımı aktlarını pisləməyə çağırır, beynəlxalq təşkilatları, dünya ölkələrini hadisələrə obyektiv qiymət verməyə dəvət edir."

Diaspor təşkilatlarının səmərəli fəaliyyəti nəticəsində 1 aprel 2009-cu il tarixdə ABŞ–ın Nevada ştatı 31 mart tarixini 1918-ci ildə qətlə yetirilmiş günahsız azərbaycanlıların xatirə günü kimi tanımışdır. Ştatın qubernatoru Cim Gibbons onun ofisinə təqdim olun-

muş bütün sənədləri və tarixi dəlilləri diqqətlə öyrəndikdən sonra müvafiq qərar qəbul etmişdir. Sənəddə həmçinin, Azərbaycanın ərazi bütövlüyünün tanınması və Dağlıq Qarabağın Azərbaycan Respublikasına mənsub olması da vurğulanır.

Azərbaycanın müxtəlif bölgələrində 1918–ci ildə ermənilərin törətdikləri cinayətlər haqqında bir sıra kitab və məqalələr yazılmış, bəzi materiallar vebsaytlara qoyulmuşdur. (7)

Bəzi Qərbi Avropa və ABŞ tarixçiləri də Azərbaycan tarixinin 1918–1920–ci illərinə aid bir sıra samballı əsərlər yazmışlar. (8)

Bu sahədə görülmüş işləri təqdir etməklə yanaşı, qeyd etmək lazımdır ki, bunların yerli oxucularla birgə beynəlxalq ictimaiyyət, xüsusilə də qərb ölkələrinin vətəndaşlarına çatdırılması vacib vəzifələrdəndir. Məhz buna görə Azərbaycanda Vətəndaş Cəmiyyətinin İnkişafına Yardım Assosiasiyası (AVCİYA) "Şamaxı soyqırımı (1918-ci il) " adlı layihə çərçivəsində həqiqətlərin dünyaya çatdırılması üçün bir neçə dildə kitab nəşr edərək beynəlxalq aləmdə yaymağı məqsədəuyğun hesab etmişdir.

AVCİYA artıq bu istiamətdə iki layihə "Xocalı soyqırımı" və "Qaradağlı facəsi" adlı layihələr həyata keçirib (bax: www.avciya.az) Bu işlər Dağlıq Qarabağ probleminin ədalətli həllinə, Azərbaycan Respublikasının ərazi bütövlüyünün bərpasına da yaxından köməklik göstərə bilər. Assosiasiya bu istiqamətdə işləri gələcəkdə də davam etdirməyi planlaşdırır.

# Şamaxı soyqırımının tarixi kökləri

Xaqani Şirvani, Fələki Şirvani, İmadəddin Nəsimi, Hacı Zeynalabdin Şirvani, Seyid Əzim Şirvani, Mirzə Ələkbər Sabir, Məhəmməd Hadi, Abbas Səhhət və başqa şəxsiyyətləri bəşəriyyətə bəxş etmiş Azərbaycanın qədim mədəniyyət mərkəzi olan Şamaxı daim yadelli işğalçıların diqqət mərkəzində olmuşdur. Azərbaycanın müxtəlif bölgələrində, o cümlədən Şamaxıda ermənilərin törətdiyi vəhşiliklərin arxasında Rusiyanın işğalçı, imperiya siyasətinin dayandığını tarixi faktlar sübut edir.

Azərbaycan ərazilərinə rusların IX yüzilliyin sonlarından etibarən başlayan işğalçı yürüşləri bu siyasətin başlanğıcını qoymuşdu. 914-cü ildə 500 gəmi ilə, hər birində 100 nəfər olmaqla Azərbaycanın Xəzər sahillərinə 50 mindən artıq rus gəlmişdi. Şirvanşah Əli ibn Heysəm təkcə quruda deyil, dənizdə də düşmənlə döyüşmüşdü. (9) 1032–1033–cü illərdə ruslar "Bərdə faciəsi"nin analoqu olan növbəti dağıdıcı basqınların birində Şamaxını ələ keçirərək on gün müddətində şəhəri talan etmiş, 10.000-ə qədər şirvanlını qılıncdan keçirmişlər. Bu faciədən 668 il sonra rus işğallarını davam etdirmək üçün I Pyotr Rusiyanın imperiya siyasətinə canla–başla xidmət etməyə hazır olan ermənilərdən istifadə etməyə başlamışdır. O "erməni işi"nin qızğın təbliğatçısı olan İsrail Orini 1701–ci ildə Şamaxıya göndərmiş, o burada müsəlmanlar əleyhinə apardığı işi qurtardıqdan sonra, 1707–1711–ci illərdə yenidən Şamaxıya gələrək burada öz təbliğatını aparmışdı. Bundan sonra I Pyotr 1721–ci il Şamaxı üsyanı zamanı rus tacirlərinin öldürülməsini bəhanə edərək Xəzəryanı bölgələrə 1722–ci ildə hücum etmiş, bu hücümda əsas hədəf kimi Şamaxını seçmişdi. O dövrdə Peterburqun diplomatiya danışıqlarında bu yürüş

rəsmi olaraq “Şamaxı yürüşü” adlanırdı. Rusiyanın qəsbkarlıq siyasətinin davamı olaraq V. Zubovun başçılığı ilə 1796–cı ildə Azərbaycan üzərinə hücuma keçən rus qoşunlarının tərkibində çoxlu sayda erməni var idi. Həmin ilin oktyabrında V. Zubov rus qoşunlarının qərargahını Yeni Şamaxıya köçürmüşdü. Lakin 1796–cı ilin noyabrında II Yekatrinanın ölümü, I Pavelin hakimiyyətə gəlməsi və onun rus qoşunlarını Qafqazdan geri çağırması ilə işğallara 1801–ci ilə qədər fasilə verilmişdi. (10)

Rus qoşunlarının 1803–cü ilin martında Car–Balakənə hücümu, 1804–cü ilin 3 yanvarında Gəncənin işğalı ilə çarizmin Azərbaycanda işğalçı siyasəti yenidən genişlənməyə başladı. Çar Rusiyası 27 dekabr 1805-ci il tarixli müqavilə ilə Şamaxı xanlığını özündən asılı vəziyyətə saldı. Müqaviləyə görə Şamaxı xanlığı ildə 8000 çervon Rusiya xəzinəsinə bac verməli idi.

1804–1813–cü illər birinci, 1826–1828–ci illər ikinci Rus–İran müharibələrindən sonra Şimali Azərbaycanın Rusiya tərəfindən işğalı, ermənilərin bu ərazilərə köçürülməsi ilə sonrakı faciələrin əsası qoyuldu.

II Rus-İran müharibəsinin sonunda bağlanmış Türkmənçay müqaviləsinə (10 fevral 1828) əsasən Rusiyanın imperiya siyasətinə uyğun olaraq ermənilər İran və Türkiyədən Şimali Azərbaycanın müxtəlif bölgələrinə, o cümlədən Şamaxıya da köçürülmüşdür. Şamaxının Mədrəsə, Sağiyan, Meysəri, Kələxana, Zarxı və s. kəndlərinə ermənilərin köçürülməsində əsas məqsəd onların köməkliyi ilə müsəlman əhalini əsarət altında saxlamaq idi. Bu siyasət əsasında Şamaxı ərazisinə Rusiyanın mərkəzi rayonlarından molokanlar da köçürülmüş və onlar burada 6 kənddə məskunlaşmışlar.

XIX əsrin ilk illərində ermənilər ölkə sakinlərinin 9,37%-ni təşkil etdiyi halda, XX əsrin əvvəlində bu rəqəm 32,6%-ə çatmışdır. Təqribən 100 il ərzində, ilk növbədə ermənilərin mexani-

ki yerdəyişməsi nəticəsində Şimali Azərbaycanda, keçmiş İrəvan xanlığının ərazisi də nəzərə alınmaqla onların sayı 24 dəfə artmış və 1916-cı ildə 1.211.145 nəfər olmuşdur. (11)

Rus tədqiqatçısı N. N. Şavrovun yazdığına görə XX əsrin əvvəlinədək Zaqafqaziyada yaşayan 1 mln. 300 min ermənidən bir milyon nəfərdən çoxu diyarın yerli sakinlərinə mənsub deyildilər və Rusiya tərəfindən burada məskunlaşdırılmışlardır. (12)

Şamaxıda müxtəlif dövrlərdə, konkret olaraq 1191-ci, 1667-ci, 1856-cı, 1859-cu, 1861-ci, 1872-ci və 1902-ci illərdə baş vermiş zəlzələlər xeyli insan itkisinə və dağıntıya səbəb olmuşdu. 1902-ci ildə baş verən güclü zəlzələ nəticəsində 2000 nəfər ölmüş, 16 min nəfər evsiz-eşiksiz qalmış, 4000 ev, 6 məscid uçmuş və bazar yanmışdı. Çar hökumətinin yerli müsəlman əhaliyə düşmən münasibəti bu dövrdə də özünü büruzə vermişdi. Zəlzələdən sağ çıxmış 16 min şamaxılıya cəmi üç həkim, bir tibb bacısı yardım göslərirdi. Hökumətdən heç bir kömək görməyən şamaxılılar özləri xilasetmə işlərinə başlamış və hətta zəlzələdən 9 gün sonra xarabalıqlar altından 12 yaşlı şamaxılı Ümmi Müslüm qızını çıxararaq xilas etmişlər. (13)

Çar xəfiyyə idarəsinin təhriki ilə 1905-1906-cı illərdə Bakıda (6-9 fevral 1905) və digər bölgələrdə ermənilər tərəfindən müsəlman qırğınları törədilsə də, bu zaman Şamaxıda ciddi qarşıdurma qeydə alınmamışdı. Lakin buna baxmayaraq Şamaxıda olan ermənilər Tiflis, Qazax, Gəncə, Şuşa və Cəbrayılda müsəlmanları qıran cinayətkarlara hər cür maddi köməklik göstərmişlər.

Rusiyanın Osmanlı İmperiyasındakı konsulu V.Mayevski həmin illərin qanlı hadisələri haqqında yazmışdı: "Bu dövrdə (1904-1906-cı illərdə) rus hakimiyyətinin zəifləməsi, bəzi hallarda isə onun əsla olmaması hər yerdə müşahidə olunurdu...Bizim cənubi–şərqi Qafqazın başına gəlmiş bəlalar həm "hakimiyyətin cinayətkar fəaliyyətsizliyi" nəticəsində, həm də çaxnaşmala-

rın əsas xadimləri olan "Daşnaksütyun"un cinayətkar fəaliyyəti nəticəsində baş verə bilərdi." (14)

Çar Rusiyasının Azərbaycanda yeritdiyi "parçala-hökmranlıq et" siyasəti ermənilərlə müsəlmanlar arasında nifaq salmaqla yanaşı, müsəlmanlar arasında da düşmənçiliyi qızışdırmaqdan ibarət idi. Bunun üçün Tiflisdə 1847–ci il dekabr ayının 13-də şiə məktəbi, 1849-cu il yanvarın 15-də isə sünnü məktəbi açılmışdır. Xalq arasında "Əli" şkolası, "Ömər" şkolası adlanan bu məktəblər şəbəkəsi tezliklə daha da genişləndirilərək Şamaxı, Quba, Şəki və başqa şəhərlərdə də təşkil olunmuşdur. Çarizmin bu bədnam siyasətinə etiraz olaraq Ü. Hacıbəyov 1907–ci ildə "İrşad" qəzetində yazırdı: "Rusiya hökuməti... əvvəlcə bizim gözümüzü yumdu ondan sonra başlayıb, şeyxülislam təyini, müfti nəsbi, "Ömər" şkolası küşadı,"Əli" şkolası təsisi, şiə zakonouçiteli, sünnü zakonouçiteli təyini ilə bərabər, sair fəsadlarla bizim aramızda əvvəlcədən qazılmış olan şiə və sünnü quyusunu daha gen və daha dərin... qazıb, rahat və arxayın oturdu" (15)

Çarizmin azərbaycanlılara inamsızlıq göstərərək onları orduya çağırmaması da müstəmləkə siyasətinin tərkib hissəsi idi ki, bu da azərbaycanlıların silahdan istifadə edə bilməməsinə, təşkil olunan milli qırğınlar zamanı onların tamamilə müdafiəsiz qalmasına səbəb olurdu. Bununla bağlı M.Ə.Rəsulzadə yazırdı: "Çarlığın Azərbaycan türklərinə endirdiyi böyük zərbələrdən biri, onu əsgərlik hikmətindən miəf tutmasıydı. Bu surətdə fitrətin cəngavər bulunan bura türklərinə əsgərlik haqqını unutdurmaq və bu surətlə onları Rusiya imperializmi zərərsiz bir hala qoymaq istəmişdi" (16).

Məhz rus çarizminin və sovet Rusiyasının yeritdiyi imperiya siyasətinin, millətlər və dinlər arasında nifaq salmaq, onları bir-birinə qırdırmaq siyasətinin nəticəsi olaraq 1918-ci ildə ermənilər tərəfindən azərbaycanlılara qarşı növbəti dəhşətli cinayətlər

törədilmişdir.

1917-ci il oktyabrın 22-də Bakı Sovetinə və 1917-ci il noyabrın 26-28-də Cənubi Qafqazda Müəssislər Məclisinə keçirilən seçkilərin nəticələri bolşeviklərin bu ərazidə çox zəif ictimai bazaya malik olduğunu subut etmişdi. Hətta yalan vədlərlə Bakıda hakimiyyəti ələ keçirmiş bolşeviklər 1918–ci ilin mart hadisələrinə qədər şəhərdəki vəziyyətə tam nəzarət edə bilmirdilər. Onlar şəhər dumasının və milli şuraların fəaliyyətini dayandıra, milli qoşun hissələrini tərkisilah edə, burjuaziyanın müqavimətini qıra bilməmişdilər. Bakı Soveti şəhərdə real hakimiyyətə nail olmaq məqsədilə özü üçün təhlükə hesab etdiyi və seçkilərdə uduzduğu "Müsavat" partiyasını sıradan çıxarmağı qarşısına məqsəd qoymuşdu. Bunun üçün isə bu təşkilatı dəstəkləyən müsəlman əhaliyə qarşı təzyiqləri artırır və bu siyasətdə ermənilərdən istifadə edirdi.

1918–ci ilin yanvar–mart aylarında erməni millətçi partiyaları müsəlman əhaliyə qarşı düşmənçiliyi artırmaq üçün müxtəlif təxribat və şantaj kampaniyasını gücləndirirdilər. S. Şaumyanın rəhbərlik etdiyi Bakı Soveti isə sovet orqanlarında ermənilərə yüksək vəzifələr verməklə onlara yaxından köməklik göstərirdi.

1918-ci ilin aprelində təşkil olunmuş Bakı Kommunasının başçısı S. Şaumyan nəinki Azərbaycan xalqının öz müqəddəratını təyin etmək hüququnu, hətta "Azərbaycan" sözünü belə qəbul etmirdi. Əmiryanın redaktoru olduğu "Bakinski raboçi" qəzeti bu sözü məsxərəyə qoymaqdan belə çəkinmirdi. (17)

Qafqaz cəbhəsinin ləğv edilməsindən sonra öz evlərinə geri qayıdan rus hərbi hissələrinin əsgərləri öz silah və sursatlarını çox ucuz qiymətə ermənilərə satırdılar. Bu zaman Rusiyada aclıq və səfalət hökm sürdüyündən hərbçilərin əksəriyyəti Rusiyaya qayıtmaqdansa Bakıda qalmağa üstünlük verirdilər. Mart soyqırımına bir həftə qalmış erməni millətçi partiyası olan "Daşnaksütyun" Bakıda hakimiyyəti ələ keçirməyin zəruri olduğunu elan etmiş-

di. Belə vəziyyətdə müsəlman əhali Bakı, Gəncə və Lənkəranda özünümüdafiə dəstələri yaratmağa başlasalar da bu işlər çox ləng aparılırdı.

Antanta dövlətlərinin bu şəraitdən erməni hərbi birləşmələrindən öz məqsədləri üçün istifadə etmək cəhdləri və bununla da yerli əhalinin faciələrinə biganə münasibətləri vəziyyəti daha da ağırlaşdırırdı. Böyük Britaniya Xarici İşlər Nazirliyinin 4 yanvar 1918–ci il tarixli gizli məlumatı ingilislərin Cənubi Qafqazdakı maraqlarını özündə əks etdirirdi. Bu sənəddə Türkiyə əleyhinə təbliğata xüsusi yer verilirdi. Cənab P. Koksun məruzəsində deyilirdi: "Qafqaz müsəlmanları arasında təbliğatın sxemi sadədir. Biz elə etməliyik ki, Ərəbistan kralı Qafqaza nüfuzlu bir nümayəndə heyəti göndərərək oradakı və Krımdakı müsəlmanlardan ərəblərin müqəddəs yerləri türk işğalçılarından azad etmələri üçün dəstək alsınlar. Bundan başqa onları müharibəni davam etdirməyə və Qafqaz cəbhəsində maksimum sayda türk əsgəri saxlamağa həvəsləndirmək lazımdır." (18)

Münaqişə dövründə qırğının qarşısını almaq məqsədilə ruhanilərin əldə etdiyi razılaşmaya erməni silahlıları belə cavab vermişdi: "Müsəlman ruhaniləri erməni ruhaniləri ilə barışa bilər, lakin erməni xalqı müsəlmanlarla müharibə istəyir və bu işdə onu İngiltərə müdafiə edəcək." (19)

Rusiya imperiyasının dağılmasından sonra erməni siyasətçilərinin ingilispərəst təbliğat aparması müsəlmanlar arasında ingilislərə münasibətin dəyişməsinə səbəb olmuşdu. Onlar Cənubi Qafqaz Seyminə müraciət edərək İngiltərə hökuməti ilə danışıqları dayandırmağı tələb etmiş və ingilis hərbi hissələrinin Qafqaza gəlməsinin əleyhinə olduqlarını bildirmişlər.

Kapitan Noel Azərbaycanda ingilislərə münasibətin pisləşməsi ilə əlaqədar 1918–ci ilin 22 yanvarında yazırdı: "Mən 6 həftə əvvəl burada olanda Azərbaycan icmasının rəhbərləri özlərini bizlə əsil

dost kimi aparırdılar. İndi, mən Bakıya qayıtdıqdan sonra onların münasibətlərinin dəyişərək şübhəli və pis gizlədilən düşmənçiliklə əvəz olunduğunu aşkara çixardım. Bu aşağıdakılarla izah oluna bilər:

1. Bizim erməni maraqlarına üstünlük verməyimizlə bağlı yayılmış ümumi rəylə.

2. Faktlar sübut edir ki, ermənilər bu rəyi gücləndirir və sərbəst şəkildə onunla alver edirlər.

3. Erməni milli alayının yaradılmasının prioritet hesab edilməsi. Mən belə hesab edirəm ki, bu "biz erməniləri müdafiə edir, müsəlmanlara etibar etmirik" kimi rus baş qərargahının baxışları ilə üst–üstə düşür. Mənim fikirimcə bu siyasət səhvdir və çox güman ki, fəlakətə aparacaq. (20)

Öz məqsədlərinə çatmaq üçün daim hiyləgər siyasət yeridən daşnaklar 1918–ci ilin mart–aprelində Antanta qüvvələri uzaqda olduğuna görə öz istəklərinə bolşeviklərin əli ilə çatmağa üstünlük verdilər.

# 1918–ci ildə Şamaxıda ermənilərin törətdiyi cinayətlər

1917-ci ildə baş verən fevral burjua inqilabından sonra yaranmış şərait "xalqlar həbsxanası" olan Rusiyanın müstəmləkələrində, o cümlədən Azərbaycanda milli şüurun inkişafına müsbət təsir göstərmişdir. Bolşeviklərin 1917-ci il oktyabr çevrilişindən sonra bəyan etdikləri "millətlərin öz müqəddəratını təyin etmək hüququ" millətlərin müstəqil dövlətlər yaratmaq arzularının reallaşdırılmasında onlara müəyyən ümidlər vermişdir. Lakin oktyabr çevrilişindən dərhal sonra bolşeviklərin sözləri ilə əməlləri arasında olan ziddiyyətlər müstəqilliyə can atan millətləri faciələrlə üz-üzə qoydu. Bolşeviklər neft və digər sərvətlərlə zəngin olan Azərbaycanın müstəqilliyinin qarşısını almaq üçün yerli əhaliyə qarşı soyqırım siyasəti həyata keçirməyə başladılar. Kommunist rəhbərlər tərəfindən 1918- ci ilin mart qırğını və 1990-cı il 20 yanvar faciəsi dövründə səsləndirilən "bizə azərbaycanlılar deyil, Azərbaycan lazımdır" sözləri bu siyasətin mahiyyətini açıb göstərir. Hazırda bir milyondan artıq azərbaycanlının öz vətənində qaçqına çevrilməsi, Dağlıq Qarabağ münaqişəsi zəminində törədilən Xocalı soyqırımı, Qaradağlı, Ağdaban və digər faciələr, Azərbaycan ərazisinin 20%-nin işğal altında olmasının da əsas səbəbi məhz bu siyasətin müasir dövrdə davam etdirilməsidir.

1918–ci il mart qırğınlarının əsas səbəbləri haqqında əvvəllər Bakıda yaşamış, sonralar Almaniyaya mühacirət etmiş, kadet partiyasının üzvü B.Baykov öz xatirələrində belə yazmışdı: "Çar Rusiyasının bütün neftini Bakı verirdi. Neftin əksəriyyəti Volqa çayı vasitəsilə Rusiya şəhərlərinə daşınırdı.Volqada buzların

ərimәsilә ticarәt gәmilәrinin fәaliyyәti martın ortalarında başlanırdı. Bolşeviklәrin tәxirәsalınmaz vәzifәsi Bakını tezliklә işğal etmәk idi." (21)

S.Şaumyanın rәhbәrlik etdiyi Bakı Sovetinin әksinqilabi elementlәrlә mübarizә şüarı altında 1918-ci ilin martından başlayaraq bütün Bakı quberniyasında yaşayan azәrbaycanlılara qarşı hәyata keçirdiyi genosiddә ermәnilәr fәal rol oynamışlar.

S.Şaumyanın göstәrişi ilә Stepan Lalayev yerli әhaliyә qarşı palanlaşdırılan cinayәtlәrә hazırlıq mәqsәdilә 1917-ci ilin sonu 1918-ci ilin әvvәlәrindәn başlayaraq gizli surәtdә Şamaxıda yaşayan ermәnilәrә silah, sursat paylamışdır. Bu dövrdә müxtәlif cәbhәlәrdәn 7.000 ermәni әsgәri Bakıya gәtirilmişdi ki, onlar Bakı Sovetinin hәrbi qüvvәlәrinin tәrkibinә daxil edilmişdi. Bu mәsәlә barәdә ermәni alimi Q. Avetisyan qeyd edir ki, "Bakıda 25 alay, 18 min döyüşçüdәn ibarәt Qızıl Ordunun dörd briqadası var idi. Qızıl Ordu döyüşçülәrinin dә 70 faizi ermәni idi". (22)

İstintaq Komissiyası tәrәfindәn hazırlanan sәnәdә görә hәlә yanvar ayında Bakı Soveti tәrәfindәn 15 maşın silah, mart ayının ortalarında isә 60 maşın silah vә 2000 ermәni әsgәri Şamaxıya göndәrilmişdi.

Yelizavetpol (Gәncә) Müsәlman Milli Şurasının sәdri Xasmәmmәdov 1918–ci il martın 28-dә Seymin vә Cәnubi Qafqaz hökumәtinin sәdrinә göndәrdiyi teleqramında yazırdı ki, martın 18-dә bolşeviklәr tәrәfindәn Bakıdan 2000 yaxşı silahlanmış top vә pulemyota malik olan әsgәr dәstәsi Şamaxı qәzası istiqamәtindә yola salınmışdır. Dәstә yol boyu 15-dәn çox müsәlman kәndini mәhv edәrәk, Şamaxı şәhәrini darmadağın etmişdir. Minlәrlә müsәlman, o cümlәdәn qadın vә uşaqlar qılıncdan keçirilmişdir. Faciәni tәsvir etmәk olmur. Tәhqir vә zorakılıqlar hәddini aşmış-

dır. Təcili hökumətin köməyi lazımdır. (23)

Azərbaycan nümayəndələrinin tələbi ilə Cənubi Qafqaz Seymi Bakı Sovetinə qarşı 100 min manat pul, piyada qoşun və süvari hissələri, iki təyyarə, zirehli qatar, çoxlu silah və sursat ayırmışdı. 1918-ci il aprelin əvvəllərində knyaz Maqalovun komandanlığı ilə 2 minə yaxın silahlı dəstə Tiflis və Gəncə tərəfdən irəliləyərək, Hacıqabul stansiyasını tutmuşdu. Eyni zamanda şimaldan, Dağıstan tərəfdən, Bakı istiqamətində Nəcməddin Qotsinskinin qüvvələri hücuma keçmişdi (24)

Lakin bütün bunlara baxmayaraq azərbaycanlılara qarşı erməni qırğınlarının qarşısını almaq mümkün olmamışdı.

Şamaxı soyqırımının baş verdiyi dəqiq tarixlər çox təəssüf ki, əksər kitab və məqalələrdə konkret göstərilməyib. Bəzi kitab və məqalələrdə hadisələrin 1918–ci il martın 18-də, bəzilərində 1918–ci ilin aprel ayında, bəzilərində 3-16 apreldə baş verdiyi qeyd olunur. Mövcud mənbələri müqayisəli təhlil etməklə cinayətlərin baş verdiyi günləri müəyyən etmək mümkündür. Araşdırmalar Şamaxı soyqırımının qısa fasilələrlə bir neçə mərhələdə, Bakı və Qubadakı qırğınlardan əvvəl baş verdiyini təsdiq edir (mötərizənin içərisində yazılan tarixlər yeni təqvimlədir–müəllif) :

I mərhələ-martın əvvələri–15 (27) mart 1918–ci il (400 erməni əsgərinin Kürdəmirdən Şamaxıya doğru irəlləməsi ilə başlayıb, 15 (27) martda dini rəhbərlərin razılaşması ilə müvəqqəti dayandırılıb.)

II mərhələ-18 (30) mart-28 mart (09 aprel) 1918-ci il. (1918–ci il martın 18- də (30) başlayıb və martın 28-də (aprelin 9-da) İ. Ziyadxanovun dəstəsinin Şamaxını azad etməsi ilə müvəqqəti qarşısı alınıb.)

III mərhələ-6 aprel (18 aprel) –20 iyul (01 avqust) 1918–ci il. (İ.

Ziyadxanovun dəstəsinin Şamaxını tərk etməsindən, martın 31–dən 6 gün sonra Şamaxının yenidən ermənilər tərəfindən tutulması ilə, yəni 1918–ci il aprelin 6-dan (18) başlayıb və Türkiyənin Qafqaz İslam Ordusu ilə birlikdə milli ordunun iyulun 20-də (avqustun 1-də) Şamaxını azad etməsinə qədər davam edib.

Faciələr Azərbaycan Xalq Cümhuriyyətinin süqutu, XI rus ordusu tərəfindən 29 aprel 1920–ci ildə Şamaxının yenidən işğalı ilə davam etmişdir. Nəzərə almaq lazımdır ki, təkcə 1920-ci ilin yazından 1921-ci ilin əvvəllərinədək Azərbaycanda 40 mindən artıq insan siyasi repressiyaya məruz qalmış, heç bir günahı olmadan güllələnmişdir. (25) Repressiyalar sonrakı illərdə də davam etmişdir. Akademik Z. Bünyadov "Qırmızı terror" kitabında yazır:" 1936-1937-ci illərdə təxminən 70-80 min azərbaycanlı ziyalı məhv edilmişdir." (26)

Şamaxıda ermənilər tərəfindən dinc əhaliyə qarşı cinayətlər, 1918-ci il martın əvvələrində rus–türk cəbhəsindən geri qayıdan 400 nəfər erməni əsgərinin Kürdəmirdən Şamaxıya gəlməsi ilə başlamışdı. Onların məqsədlərindən xəbərsiz olan Bakı Müsəlman Komitəsi Şamaxı şəhər rəhbəri Teymur bəy Xudaverdiyevə məlumat verərək Şamaxıya qayıdan erməni əsgərlərinə yardım göstərməyi xahiş etmişdi. Buna görə də Şamaxı rəhbərliyi onları qarşılamaq üçün Ağsuya nümayəndə heyəti göndərmişdi. Lakin nümayəndə heyəti yolda olarkən xəbər tutmuşdu ki, həmin erməni dəstəsi bir neçə hissəyə bölünərək müdafiə cəhətdən ən zəif yaşayış məntəqələri olan Bico vəLəngəbiz kəndlərinə hücum etmişlər. Atışma nəticəsində bir neçə müsəlman və erməni ölmüşdür. Bu hadisədən daha da azğınlaşan ermənilər dərhal Bakı erməni komitəsinə məlumat vermişlər. Onlar da yerli əhalini tamamilə məhv etmək üçün az müddət ərzində müxtəlif silah-

larla təhciz edilmiş 3 min ermənini Şamaxıya göndərmişlər. Bundan xəbər tutan Müsəlman İcraiyyə Komitəsinin yerli şöbəsi Şamaxı əyalət rəisi Hacıcamalbəyovu, əyalət qazisi Abdulxalıq Əfəndi Əfəndiyevi və erməni yepiskopunu onlarla danışıqlara göndərmişdi. Nümayəndə heyəti onlardan geri qayıtmalarını xahiş etdikdə, erməni quldur dəstəsinin başçısı cavabında bildirmişdi ki, "biz bura qayıtmaq üçün deyil, Şamaxını yerlə-yeksan etməyə, müsəlman əhalini tamamilə qırmağa gəlmişik".

Bundan sonra nümayəndə heyəti Şamaxıya qayıdaraq vəziyyətdən çıxış yolları axtarmağa başlamışlar. Ertəsi gün erməni yepiskopu Baqrat və molokanların nümayəndəsi Karabanov Müsəlman İcraiyyə Komitəsinin Şamaxı şöbəsinə gələrək Xaç və İncil qarşısında azərbaycanlılarla sülh və qardaşlıq şəraitində yaşayacaqlarına və heç vaxt onlara qarşı silahlı çıxış etməyəcəklərinə and içərək söz vermişlər. Səhəri günü 18 mart 1918-ci il tarixdə səhər saat 6-00 da ermənilər Şamaxını mühasirəyə alaraq 10 topdan, yüzlərlə pulemyotlardan və digər silahlardan şəhəri atəşə tutmuşlar. Bundan sonra şəhərin bir neçə məhəlləsində yanğınlar başlamışdı. Həmin gün axşam müdafiəsiz qalan şəhər əhalisi təslim olmağa məcbur olmuşdu. Bundan sonra ermənilər dinc əhaliyə qarşı dəhşətli soyğunçuluq və qırğınlar törətməyə başlamışlar. Şamaxıya daxil olan erməni yaraqlıları şəhəri yenidən talan etmişlər. Şəhərdə az-çox salamat qalmış tikililər yandırılmış, şəhər yaxınlığında olan qəbristanlıqlar təhqir edilmişdi. Şamaxıda ermənilər törətdikləri qətlləri xüsusi qəddarlıqla həyata keçirmişlər. Belə ki, qətl edilənlərin qolları, qıçları, burunları, qulaqları kəsilmiş, gözləri çıxarılmış, qarınları yırtılmış, yandırılmış, çox böyük əziyyətlərlə öldürülmüşlər.

Şamaxı hadisələri ilə bağlı "Azərbaycan" qəzetinin 1918–ci

il 19 saylı buraxılışında gedən bir yazıda qeyd olunmuşdu ki, S.Lalayevin Şamaxı müsəlmanlarına tutduğu divan bizim bu müharibə dövründə üzləşdiyimiz bütün dəhşətləri geridə qoyur.

Şamaxıda qırğına rəhbərlik edən S. Lalayevin qəddarlığı o həddə çatmışdır ki, bu hətta onun silahdaşları olan T. Əmirov və İ. Boqomolovun da narazılığına səbəb olmuşdu.

İ. Boqomolovun A. Caparidzenin adına göndərdiyi müraciətdə deyilirdi: "Bir daha sizdən xahiş edirəm ki, cəllad Lalayevi həbs edəsiniz. O, çoxlu sayda qadın və uşaq öldürmüş, evləri qarət etmişdir. Əmirov onu, həbs etmək istədikdə, qaçıb gizlənmişdir. Hamı təsdiq edir ki, o, məscidi yandırmış və orada çoxlu qadın qətlə yetirmişdi." Lakin bu müraciətə A. Caparidzedən heç bir cavabı olmamışdır. Çünki o, S. Lalayevi himayə edən S. Şaumyanın onun həbsi ilə bağlı hərbi–istintaq komissiyasının sədri Kojemyakoya etdiyi etirazdan xəbərdar idi. (27)

Şamaxıda baş verən cinayətlərin daha qəddarlıqla həyata keçirilməsində rus və erməni millətçilərinin anti–türk, anti-müsəlman siyasəti ilə yanaşı, S.Lalayevin şəxsi intiqam hissi, yerli əhaliyə bəslədiyi kin–küdurətin də müəyyən təsiri olmuşdur. O, 1905–1906–cı illərdə baş vermiş erməni–müsəlman qırğınları zamanı öldürülmüş atasının və əmisinin intiqamını şamaxılılardan almaq üçün dinc əhaliyə qarşı görünməmiş vəhşiliklər törətmişdi. Lakin faktlar sübut edir ki, 1905–1906–cı illərdə onun atası və əmisi öz cinayətkar əməllərinin qurbanı olmuşlar. Bakı Mixaylov xəstəxanasının sənədlərinə görə, 1905-ci ilin 6 fevralında erməni milyonçuları Balabek Lalayevin, Artyom Babayantsın, İsay Ter Osipovun və başqa maqnatların havadarlığı ilə terror qrupu 18 adamı öldürmüş və 33 nəfəri yaralamışdır. Onların 34-ü azərbaycanlı, 6-cı rus, qalanları başqa millətlərin nümayəndələridir. Həmin

cinayətkar qrup ertəsi gün 100-dək dinc vətəndaşı öldürmüş və yaralamışdı. (28)

Şamaxıda ermənilərin törətdikləri vəhşiliklər o qədər dəhşətli olmuşdu ki, hətta nə qədər çalışsalar da o dövrdəki bolşevik mətbuatı da bu faciəyə öz münasibətini gizlədə bilməmişdi. Lakin onlar müsəlman əhaliyə qarşı edilən bu vəhşiliklərə "dinc əhaliyə qarşı da bəzi haqsızlıqlar törədildi" kimi loyal münasibət bəsləməklə kifayətlənmişlər.

S.Lalayev və T.Əmirovun rəhbərliyi ilə təkcə Şamaxı şəhərində bir neçə gündə minlərlə müsəlman qətlə yetirilmişdir. O dövrdə Şamaxının adlı-sanlı şəxsiyyətlərindən olan Molla Cəfərqulu Axund, şəhər hakimi Teymur bəy Xudaverdov, birinci dövlət dumasına Şamaxıdan deputat seçilmiş Məmməd Əliyev, Molla Hacı Məhyəddin Əfəndi, Hacıbaba Abbasov, Əşrəf Hacıyev, Hacı Əbdül Xəlil Əhmədov, Ağa Əhməd Əhmədov, Hacı Qəni Zeynal, Hacı Əbdül Hüseyn Zeynalov, Hacı İsrafil Məmmədov, Mir İbrahim Seyidov, Hacı İbrahim Salamov, Hacı Əbdül-Qasım Qasımov, Əyyubağa Veysov, Zeynəb xanım Veysova, Əliabbas bəy İbrahimbəyov, Ələkbər Qədirbəyov, Əbdürəhim ağa Ağalarov, Zəkəriyyə Əfəndi Mehdi Xəlil oğlu, Ziyəddin Abdullayev, Hacı Molla Həsən Zeynalov, Mahmud Hacıağa oğlu və bir çox başqaları da öldürülənlərin arasında idi.

Şamaxıda bu dövrdə ermənilər tərəfindən 13 məhəllə məscidi və məşhur müqəddəs ocaq-Cənubi Qafqazda və Yaxın Şərqdə ən qədim müsəlman məbədlərindən olan, 743-cü ildə inşa edilmiş Cümə məscidi də yandırılmışdı. Bu məscid müsəlmanlara həm bir qibləgah, həm də qədim abidə kimi əziz idi. Çoxlu sayda qadın və uşaq həyatlarını xilas etmək üçün bu məscidə pənah gətirmişdi. Onlar belə hesab edirdilər ki, əhali arasında böyük nüfuza malik

olan Molla Cəfərqulu Axundun da içərisində olduğu allah evinə ermənilər toxunmağa cürət etməzlər. Lakin erməni quldurları məscidə daxil olan kimi Axundun gözlərini çıxarmış, dilini, qulağını, burnunu kəsmiş, diri–diri dərisini soyaraq güllələmişdilər. Bundan sonra dinc əhalini məscidə yığaraq yandırmışlar. (29)

Şamaxıda 1918–ci ilin mart–aprel aylarında öldürülənlərin sayı haqqında müxtəlif məlumatlar mövcuddur. Bəzi məlumatlarda öldürülənlərin sayı 7 min, bəzilərində 8 minə qədər, bəzilərində 8–12, bəzilərində isə 40 minə qədər olduğu göstərilir. 1920–ci ildə mühacir ədəbiyyatında öldürülənlərin sayı bir mənbədə 12 minə qədər, digər bir mənbədə isə 17 min nəfər olduğu göstərilir. (30)

Azərbaycan Xalq Cümhuriyyəti hökuməti tərəfindən Fövqəladə İstintaq Komissiyası 1918–ci ilin mart–aprel aylarında Şamaxı qəzasının azərbaycanlılar yaşayan 58 kəndinə ermənilərin hücumu zamanı ölənlərin sayının aşağıdakı kimi olduğunu müəyyən etmişdir:

| № | Kəndin adı | Ölənlərin sayı | | | Yaralı |
|---|---|---|---|---|---|
| | | Kişi | Qadın | Uşaq | |
| 1 | Cəyirli | 40 | 20 | 15 | 4 |
| 2 | Ərəbqədim | 200 | 100 | 78 | Yox |
| 3 | Cəmcəmli | 15 | 5 | 6 | Yox |
| 4 | Mırtı | 4 | | 1 | - |
| 5 | Talış -Məlik | 11 | 4 | 1 | - |
| 6 | Mirikənd | 8 | 9 | 2 | Yox |
| 7 | Şərədil | 10 | 5 | 5 | Yox |
| 8 | Quşçu | 192 | 115 | 25 | Yox |
| 9 | Şıxməzid | 10 | 5 | 3 | Yox |
| 10 | Yuxarı Çağan | 1 | - | - | - |
| 11 | Ağabəyli | 7 | 3 | 4 | Yox |
| 12 | Qaravəlli | 40 | 50 | 30 | Yox |

| | | | | | |
|---|---|---|---|---|---|
| 13 | Barbar Navahı | 15 | 10 | 5 | Yox |
| 14 | Gorus -Çaparlı | 10 | 15 | 10 | 1 |
| 15 | Kürdəmir | 25 | - | - | - |
| 16 | Qonaqkənd | 25 | 5 | 4 | Yox |
| 17 | Ovculu | 5 | 10 | 12 | Yox |
| 18 | Bağırlı | 80 | 150 | 140 | Yox |
| 19 | Təkəli | 360 | 412 | 150 | Yox |
| 20 | Hacılı | 40 | 60 | 30 | Yox |
| 21 | Dilman | 300 | 235 | 50 | Yox |
| 22 | Kalva | 250 | 150 | 100 | 2 |
| 23 | Xatman | 60 | 40 | 20 | Yox |
| 24 | Suraxanı | 11 | 3 | 6 | Yox |
| 25 | Xəsiqara | 46 | 20 | 16 | Yox |
| 26 | Tirğan | 300 | 40 | 20 | Yox |
| 27 | Talışnuru | 20 | 5 | - | - |
| 28 | Sərdakar | 8 | 12 | 8 | Yox |
| 29 | Zərqəva | 40 | 4 | 5 | Yox |
| 30 | Xankəndi | 12 | 8 | - | Yox |
| 31 | Təbiyə | 12 | 3 | 2 | Yox |
| 32 | Makahı | 6 | 1 | 1 | Yox |
| 33 | Tağlabiyan | 7 | 22 | 7 | Yox |
| 34 | Girdivan | 10 | 5 | 7 | Yox |
| 35 | Kələrağ | 1 | - | - | - |
| 36 | Bizlən | 50 | 30 | 20 | Yox |
| 37 | Müci | 150 | 50 | 25 | Yox |
| 38 | Qıraltan | 30 | 20 | 21 | Yox |
| 39 | Pir qaraçuxa | 4 | 3 | 5 | Yox |
| 40 | Sulut | 38 | 1 | 4 | - |
| 41 | Zeyvə | 30 | 20 | 32 | Yox |
| 42 | Nuran | 30 | 50 | 37 | Yox |
| 43 | Nüydi | 40 | 7 | 10 | Yox |
| 44 | Qəşəd | 50 | 40 | 27 | Yox |
| 45 | Sündi | 250 | - | - | - |

| | | | | | |
|---|---|---|---|---|---|
| 46 | Şıxlar | 4 | - | - | - |
| 47 | Bəlkə | 16 | - | - | - |
| 48 | Ağsu | 200 | - | - | - |
| 49 | Qəməli | 9 | 18 | 16 | - |
| 50 | Məlik çobanı | 10 | - | - | - |
| 51 | Çuxanlı | 52 | - | - | - |
| 52 | Qurbançı | 93 | - | - | - |
| 53 | Mərəzə | 300 | - | - | - |
| 54 | Nabır | 60 | - | - | - |
| 55 | Qaradüzlü | 8 | - | - | - |
| 56 | Ərəbşahverdi | 22 | - | - | - |
| 57 | Çaylı Vahidbəyli | 5 | - | - | - |
| 58 | Şıxzərli | ? | - | - | - |
| | Cəmi | 3632 | 1771 | 956 | 7 |

Lakin ekspertlərin arxivdəki aktlarda olan rəqəmlər üzrə hesablamalarına görə Şamaxı qəzasının 53 kəndində ermənilər 8027 nəfər azərbaycanlını qətlə yetirmişlər ki, onlardan da 4190 nəfəri kişi, 2560 nəfəri qadın və 1277 nəfəri uşaq olmuşdur. Hesablamalara görə bu kəndlərə dəyən ümumi maddi zərər o dövrün qiymətləri ilə 339,5 milyon manat olmuşdur. Digər mənbədə isə Şamaxının 72 kəndində ermənilərin 7 min nəfəri, o cümlədən 1653 qadın və 965 uşağı qətlə yetirdiyi bildirilir. (31)

Bu dövrdə Şamaxı qəzasında 120 kənd olmuşdur ki, bunlardan da 86-sı erməni təcavüzünə məruz qalmışdı. Göründüyü kimi, komissiya öz işini dayandırdığından, soyqırıma məruz qalmış digər 33 kənd haqqında məlumat toplamaq mümkün olmamışdı. Şamaxı qəzası üzrə təcavüzə məruz qalmış kəndlər hazırda Şamaxı, Qobustan, Kürdəmir, Ağsu, İsmayıllı rayonlarının ərazisində yerləşir.

Ermənilərin 1918–ci ildə Şamaxı qəzasında cinayət törətdikləri 86 kənd aşağıdakılardır:

Qəbristan nahiyəsi (Qobustan) (19 kənd) -Mərəzəli, Şıxlar, Çuxanlı, Sündi, Mərzəndiyə, Nabur, Təklə-Hacı Məmməd Hüseyn, Yekəxana Talıb, Qurbançı, Ərəbşahverdi, Ərəbşalbaş, Cəmcəmli, Sıxzərli, Qaracüzlü, Təsi, Təklə-Mirzəbaba, Bəklə, Çəyirli, Ərəbqədim.

Mədrəsə nahiyəsi (41 kənd) –Güyzi, Çaylı, Mirikənd, Muğanlı, Mırtı, Talış-Məlik-Umud, Şərədil, Qaravəlli-Vahid bəy, Məlcək, Xınıslı, Ağabəyli, Avtahi, Bico, Alpout, Osmanbəyli, Ləngəbiz, Qəşəd, Keçidinməz, Çarhan, Nüydü, Boyat, Adnalı, Kürdəmic, Qonaqkənd, Həmyəli, Cabanı, Çaylı-Baxış bəy, Avaxıl, Yuxarı Çağan, Dədəgünəş, Aşağı Çağan, Əngəxaran, Gəgəli, Cavanşir, Ağsu, Şeyməzid, Gorus- Çaparlı, Bortor-Navahı, Bağırlı, Ovçulu, Göylər.

Qoşun nahiyəsi (26 kənd) -Nügədi, Nuran, Zeyla, Pur Qara-Çuxa, Suraxanı, Kiçatan, Koleybugut, Şabian, Maçahi, Tağlabiyan, Kelerarac, Koyurdivan, Pir Əbdül-Qasım, Bizlyan, Müdji, Gaciman, Dilman, Kelva (Nevla), Hatman, Hosa-dara, Sulut, Tircan, Talış-Nuri, Hon-kend, Sardagar, Zargava. (32)

1918–ci ildə ermənilər tərəfində qırğınlar törədilmiş kəndlərin bir hissəsi hazırda İsmayıllı rayonu ərazisinə düşür. Bunu www.ismayilli.aztelekom.org saytına qoyulmuş aşağıdakı məlumat da təsdiq edir:

| İsmayıllı rayonu üzrə<br>1918-ci il soyqırımının qurbanları | | | | | |
|---|---|---|---|---|---|
| s/s | Kəndlərin adı | Cəmi | Kişilər | Qadınlar | Uşaqlar |
| 1 | Tircan | 360 | 300 | 40 | 20 |
| 2 | Mücü | 225 | 150 | 50 | 25 |
| 3 | Bizlan | 100 | 50 | 30 | 20 |
| 4 | Qıçatan | 71 | 30 | 20 | 21 |

| | | | | | |
|---|---|---|---|---|---|
| 5 | Sulut | 43 | 38 | 1 | 4 |
| 6 | Zeyvə | 82 | 30 | 20 | 32 |
| 7 | Tağlabyan | 36 | 7 | 22 | 7 |
| 8 | Kürdüvan | 22 | 10 | 5 | 7 |
| 9 | Zərnava | 49 | 40 | 4 | 5 |
| 10 | Xankəndi | 20 | 12 | 8 | 0 |
| 11 | Sərdahar | 28 | 26 | 1 | 1 |
| 12 | Maçaxı | 8 | - | - | - |
| 13 | Kürtmaşı | 68 | - | - | - |
| 14 | Diyallı | 36 | - | - | - |
| 15 | Talıstan | 24 | - | - | - |

Şamaxıda 1918–ci ilin mart–aprel aylarında öldürülənlərin sayının dəqiqləşdirilməsi ilə bağlı ötən əsrin 90-cı illərindən bəri Şamaxının yerli tədqiqatçıları da ciddi araşdırmalar aparmışlar. Onların tədqiqatı nəticəsində (yüz nəfərə yaxın şahiddən toplanan xatirə və məlumatlar) müəyyən edilmişdir ki, erməni cinayətkarları - S.Şaumyan, S.Lalayev, Z.Arestisyan, T.Əmirov və A.Əmiryan qardaşlarının rəhbərliyi və yerli havadarlarının iştirakı ilə Şamaxı şəhərində təqribən, 14-16 min, onun 40 kənd və obalarında (bugünkü Şamaxı və Qobustan rayonları ərazisindəki kəndlər) 6-8 min nəfəri qətlə yetirmişlər. Şamaxı şəhəri, onun kənd və obalarından didərgin, qaçqın düşənlərin sayı isə 18 min nəfərdən çox olmuşdur. Mənbələrdə bu qırğın zamanı Şamaxı qəzasında 58 kəndin yerlə-yeksan edildiyi, yandırıldığı haqqında məlumat verilir. Həmin siyahıya faciə törədilmiş bəzi kənd və obaların adı düşməmişdir. Həmin kənd və obaları da siyahıya daxil edəndə məlum olur ki, 1918-ci il soyqırımı zamanı Şamaxı qəzasının 90-a yaxın, rayonun isə 40-dan artıq kənd və obası

faciəyə məruz qalmışdır. (33)

Ermənilərin Şamaxı şəhəri ilə yanaşı, kəndlərdə törətdikləri vəhşiliklərə misal olaraq Əngəxaran kəndində baş verənləri göstərmək olar.

Ermənilər martın 18-də sübh çağı Şamaxının 3-4 verstliyində olan Əngəxaran kəndinə də qəfil hücum etmişdilər. Əngəxarana soxulan düşmənlər kəndi mühasirəyə alaraq oradakı əhalini qırır, kəndi qarət edir, yandırır və sağ qalan əhalini isə əsir alırdılar. Əsir alınmış Əngəxaran sakinlərinin uşaqları azərbaycanlı kəndi olan Məlhəmə aparılıb orada saxlanılır. 88 kişini isə Çuxuryurda aparırlar. Kəndə çatmamış onlar əsirləri bağda saxlayaraq bir neçə nəfərini güllələyirlər. Qalan 76 nəfəri isə əsir kimi Mədrəsə kəndində yerləşən erməni qərargahının sərəncamına göndərirlər. Yolda iki nəfəri də güllələyirlər. Mədrəsə kəndinə cəmi 74 nəfər sağ azərbaycanlı gəlib çıxır. Gəncədən gələn İ.Ziyadxanovun silahlı dəstəsi Şamaxıya girdikdə əngəxaranlılar qohumlarının taleyindən xəbər tutmaq üçün Mədrəsə kəndinə gedirlər. Onlar kəndin kənarında əngəxaranlı əsirlərin hamısının öldürüldüyünü və meyitlərinin eybəcər hala salındığını görürlər. Meyitlərin qulaqları, burunları, əlləri və ayaqları kəsilmiş, bir çox ölülərin döşlərində yanıq izləri aşkar edilmişdir. Bu da sübut edirdi ki, hələ sağ ikən ermənilər onların sinələri üzərində od qalamışlar. Bundan başqa dağıdılmış kənddən qaçıb canını qurtara bilmiş Əngəxaran sakinlərinin çoxu aclıqdan, soyuqdan və xəstəlikdən tələf olmuşlar.

Əngəxaranda ermənilərin törətdikləri vəhşiliklərlə əlaqədar təhqiqat materiallarında həmkəndlilərinin və şahidlərin ifadələrinə görə tərtib edilmiş siyahılarda bu kənddən ermənilərin böyük işgəncələrlə qətlə yetirdiyi 237 nəfərin adı var. (34)

Şamaxı şəhərinin sakini Mövsüm bəy Sadıqbəyov Azərbaycan hökuməti yanında təşkil edilmiş Fövqəladə İstintaq Komissiyası tərəfindən dindirilərkən bildirmişdir ki, mən hələ Kürdəmirdə olduğum vaxt eşitdim ki, ermənilər Mədrəsəyə yanvar ayının əvvəllərindən başlayaraq on iki, yaxud on altı araba silah gətirmişlər.

Bu hadisənin şahidi olan Şamaxı sakini Məhiyyəddin Əfəndi oğlu isə bu barədə belə ifadə vermişdir: “Ermənilər Şamaxını top atəşinə tutduqdan sonra əhali küçəyə qaçdı... Bir neçə saatdan sonra ermənilər şəhərə basqın edib, evləri yandırmağa və adamları güllələməyə başladılar. Bu qırğına Qavril, Qaraoğlanov, poçt-teleqraf idarəsinin rəisi Gülbəndov, Qaramanov, dəllək Samvel, dəllək Ovanes, Stepan Lalayev, mədrəsəli Sidrak və bir çox başqaları rəhbərlik edirdilər.

Bu qırğından birtəhər canlarını qurtarıb qaçan azərbaycanlılar Kürdəmirdə, Gəncədə özlərinə sığınacaq tapmaqla Şamaxıda erməni əsirliyində qalmış müsəlmanları xilas etmək üçün müxtəlif qurumlara müraciətlər etmişlər. Bundan sonra martın 28-də İsmayıl xan Ziyadxanov kiçik bir dəstə ilə Şamaxıya daxil olmuşdu. Ermənilər silahlı toqquşmadan ehtiyat edərək Qozluçay kəndinə çəkilərək, burada qüvvə toplamağa başlamışlar.

İsmayıl xan Qozluçay kəndində toplaşmış ermənilərin təslim olmasını tələb edərək iki gün gözləmişdi. Bundan sonra ermənilərə əlavə kömək gəldiyindən onlar təslim olmaqdan imtina etmişlər. İ. Ziyadxanovun dəstəsi qüvvələr nisbəti qeyri-bərabər olduğundan geri çəkilməyə və elə həmin gün axşamüstü Şamaxını tərk etməyə məcbur olmuşdu. Bundan altı gün sonra yenidən Şamaxıya daxil olan ermənilər əvvəlki vəhşiliklərini davam etdirmişlər.

Bu hadisənin şahidi olan S.Əfəndiyev qeyd edir ki, Şamaxı-

da meyid əlindən tərpənmək mümkün deyildi. Hər addımbaşı müsəlmanların vəhşicəsinə öldürülmüş meyidlərini görürdüm. Bir yerdə gördüyüm dəhşətli mənzərə heç vaxt yadımdan çıxmayacaq. İki nəfər insanın-öldürülmüş kişi və qadın meyidləri üzərində yarıya bölünmuş 3-4 yaşlı uşaq meyidi qoyulmuşdu. (35)

Şamaxıda əhalinin sayının müqayisəli təhlili çar və bolşevik Rusiyasının apardığı anti–müsəlman siyasətinin acı nəticələrini üzə çıxarmağa imkan verir. Əgər 1811-ci ildə Şamaxı xanlığı ərazisində 24 min ailə, 1918-ci ildə Şamaxı qəzasında 15 min əhali yaşayırdısa, 1921-ci ildə əhalinin sayı 1700 nəfərə enmişdi ki, bu da faciələrin necə böyük miqyasda aparıldığını bir daha sübut edir. (36)

Şamaxı qırğınından salamat qalan qaçqınlar Göyçay qəza mərkəzinə üz tutmuşdular. Lakin qırğından xilas olub, aclığa, soyuğa, hər cür ağır məhrumiyyətə dözən şamaxılılar Qarasu deyilən bataqlığın suyundan içdiklərinə görə yoluxucu xəstəliklərə yoluxaraq, kütləvi şəkildə qırılmışlar. Azərbaycanın görkəmli şairi Abbas Səhhət də Şamaxıdakı qırğından yaxa qurtarmasına baxmayaraq, həmin ildə aclıq və soyuqdan xəstələnərək Gəncədə vəfat etmişdi.

Şamaxı və Bakının düşməndən azad edilməsi beynəlxalq güclərin Rusiya ilə Azərbaycan və Türkiyənin əleyhinə gizli sövdələşmələr apardığı, Antanta və Üçlər İttifaqı rəhbərlərinin düşmənə dəstək verdiyi çox gərgin bir dövrə təsadüf edirdi.

Bakı Soveti süqut etdikdən sonra 1918-ci il avqustun 1-də İngilis konsulu Mak Donelin iştirakı ilə Rəyasət Heyətinin sədri-A.Arakelyan olmaqla Bakıda eser-daşnak-menşeviklərdən ibarət Sentrokaspi diktaturası yaradılmışdı. Həmin qurumun dəvəti ilə 4 və 18 avqustda polkovnik Stokson və general Denstervil başda ol-

maqla 1500 nəfərlik Britaniya ordusunun Bakıya gəlməsi, Almaniyanın sovet Rusiyası ilə 27 avqust 1918–ci il tarixdə Berlində Brest müqaviləsinə əlavə sazişin imzalaması bunu sübut edir. Həmin müqavilənin Qafqazla əlaqədar IV hissəsində aşağıdakı şərtlər irəli sürülmüşdü:

1) Rusiya almanların müstəqil Gürcüstanı tanıması ilə razılaşacaqlar;

2) Almaniya Gürcüstan ərazisindən kənarda və Türkiyənin Brest–Litovsk müqaviləsi ilə müəyyənləşdirilmiş sərhədlərində üçüncü bir dövlətə hərbi yardım etməyəcəkdi;

3) Almaniya hər hansı bir üçüncü dövlətin Şamaxı və Bakı qəzalarının sərhədlərini keçəcəyi təqdirdə ölçü götürəcəkdi;

4) Rusiya Almaniyaya ya Bakıdan çıxarılan neftin dörddə bir hissəsini, ya da xüsusi aylıq faiz göndərəcəkdi. (37)

Lakin bütün bu çətinliklərə baxmayaraq 1918–ci ilin 6 iyun–20 iyul tarixlərində Ucar, Müsüslü, Kürdəmir, Göyçay, Qaraməryəm, Ağsu isqiamətlərində gedən qanlı döyüşlərdən sonra Şamaxı düşməndən azad olunmuşdu. İyulun 19-da güclü yağış yağmasına baxmayaraq Qafqaz İslam Ordusunun 13–cü piyada taqımı hücuma keçərək 20 iyul səhər saat 6–00 da Göylər, Çuxanlı, Məlik Çobanlı, Mərəz kəndlərini azad etdikdən sonra Şamaxını düşməndən təmizləmişlər. Çuxanlı və Məlik Çobanlı kəndlərində düşmənin 1 topu, 2 pulemyotu, 1 yük və 1 zirehli avtomobili qənimət olaraq ələ keçirilmişdi. Əsirlərin arasında 1 zabit və 4 əsgər olmaqla 5 ingilis hərbiçisinin olması sübut edir ki, hələ Sentrokaspi diktaturası qurulmamışdan və ingilislər Bakıya gəlməmişdən əvvəl ingilis hərbiçiləri Qafqaz İslam Ordusuna qarşı döyüşlərdə bolşevik–erməni qüvvələrinə gizli şəkildə hərbi yardımlar etmişlər. (38)

1918–ci ilin avqust–sentyabr aylarında qardaş Türkiyənin Qaf-

qaz İslam Ordusunun Azərbaycan hərbi qüvvələri ilə birlikdə Bakıya yaxınlaşmasından təşvişə düşən bolşevik komissarlar və Sentrokaspi diktaturasının rəhbərləri qaçarkən Bakı bankından özlərinə məxsus olmayan milyonlarla manat pul götürsələr də, əhalidən qarət etdikləri səkkiz qutu və iki torbada olan ziynət əşyalarını aparmağa macal tapmamışlar. Bunları müsadirə edən Azərbaycan Hökuməti ciddi ehiyac içində olmasına baxmayaraq 1918–ci ildə quldurların əhalidən qarət etdiyi bu zinət əşyalarını sahiblərinə qaytarmaq üçün komissiya təşkil etmişdir. (39)

Bakı azad olunduqdan sonra 1918–ci il sentyabrın 17–də Azərbaycan hökuməti əhaliyə müraciət etmişdi. Hökumətin başçısı F. Xoyski muraciətlə bağlı demişdi: "Burada müsəlmanlar qırılmış, namusuna, canına təcavüz edilmiş, əlindən ixtiyarı qoparılmış,… üç gün davadan sonra şəhər alınmış, əhali və qoşun şəhərə acıqlı girmiş idi… hökumət üç gündən sonra Bakıya girdi. O vaxtadək nə olmuşsa da hökümət gəldikdən sonra Azərbaycan hökuməti adından Bakıya və onun ətrafı əhalisinə məlumatla müraciət etdi. Bu məlumatda millətindən, dilindən, asılı olmayaraq Azərbaycanda yaşayan bütün vətəndaşların bərabər hüquqa malik olduğu, onların həyatı, əmlakı və hüquqlarının qorunacağı, ictimai qayda-qanunu pozanların müharibə qaydası ilə cəzalandırılacağı göstərilirdi." (40)

Hökumətin bu müraciəti Azərbaycan Xalq Cümhuriyyətinin bolşevik- daşnak rejimindən fərqli olaraq sivil, hüquqi dövlət olduğunu bir daha sübut edir.

N.Nərimanov Şamaxı qırğını haqqında yazırdı: "Şamaxıdan qayıdandan sonra... M.Əzizbəyov göz yaşı içində şahidi olduğu faciəni mənə danışdı. T. Əmirovun və S.Lalayevin əvvəllər Bakıda olan silahlı dəstələri yaşına və cinsinə məhəl qoymadan bütün

azərbaycanlıları öldürdülər; onlar hələ dünyada görünməmiş bir cinayət törətdilər, uşaqları süngü və qılıncdan keçirir, adamları məscidə toplayıb kerosin töküb yadırırdılar. Mənim üçün aydın oldu ki, Bakıda Sovet hakimiyyəti daşnaklardan, asılıdır. Bu da aydındır ki, erməni bandaları tərəfindən azərbaycanlı əhaliyə edilən bu qədər zülmdən sonra Azərbaycan proletariatının Sovet hakimiyyətindən üz döndərməyə öz burjuaziyasının hamiliyi altına keçərək, ondan və Türkiyədən kömək gözləməyə haqqı var idi”. (41)

Azərbaycan Xalq Cümhuriyyəti dövründə (may 1918–aprel 1920) 1919 və 1920-ci il martın 31-i Milli Matəm günü kimi qeyd edilib. Bu dövrdə nəşr olunan “Azərbaycan” qəzetinin səhifələrində azərbaycanlılara qarşı ermənilərin törətdikləri vəhşiliklərə aid çoxlu sayda tükürpədici faktlar yazılmışdı. Həmin dəhşətli günlərin şahidi olmuş alman A.Y.Kluqe 1918–ci il hadisələri haqqında yazırdı ki, ermənilər müsəlman (azərbaycanlı) məhəllələrinə soxularaq hər kəsi öldürür, qılıncla parçalayır, süngü ilə dəlmə-deşik edirdilər. Qırğından bir neçə gün sonra bir çuxurdan çıxarılan 87 azərbaycanlı cəsədinin qulaqları, burunları kəsilmiş, qarınları yırtılmış, cinsiyyət orqanları doğranmışdır. Ermənilər uşaqlara acımadıqları kimi, yaşlılara da rəhm etməmişdilər. M.Ə.Rəsulzadə A.Y.Kluqeyə istinadən yazırdı: “Kluqenin, digər əcnəbilərin o günlərin xatirəsi olmaq üzrə almış olduqları və bu gün əllərdə mövcud olan fotolar çox faciəli mənzərələri əks etdirir. Bir yığın qızlı-erkəkli cocuq ölüləri üzərində qocaman çoban köpəkləri bu məsum yavruları gəmirir... Çılpaq bir qadın yerə sərilmiş, ölmüş... bu ölü vücudun qurumuş məməsini canlı bir yavru əmməkdədir...”

Bu kimi faktların yer aldığı M.Ə.Rəsulzadənin redaktorluğu ilə Münhen şəhərində nəşr olunan “İstiqlal” qəzetinin 1933-cü il 1 ap-

rel tarixli 31-ci sayı demək olar, bütünlüklə 1918-ci il qırğınlarının 15 illiyinə həsr edilmişdi. (42)

M. Ə. Rəsulzadə Şamaxı faciəsi barədə yazırdı: "Əski Şirvanşahların bu qədim paytaxtı bir həmlədə atəşə verilib məşhur tarixi cameyə varıncaya qədər yaxıldı... Şamaxının düçar olduğu təcavüzə Lənkəran, Salyan, Quba, Nəvahi və Kürdəmir kimi qəza, şəhər və qəsəbələr dəxi məruz qaldı. Bu təcavüzlər əsnasında yaxılan xanimanların, qıyılan ərz və namusların, kəsilən qarı qocaların, yağmaya gedən mal və məvaşinin təsviri qeyri-qabili–təsəvvür bir faciə təşkil edir. (43)

Mart hadisələrinin ildönümündə "Azərbaycan" qəzetinin 31 mart 1919–cu il tarixli sayında Fövqəladə İstintaq Komissiyasının sədri Ələkbər bəy Xasməmmədovun ağır vəziyyətdə olan şamaxılılara kömək üçün Azərbaycan xalqına müraciəti çap olunmuşdu. Müraciətdə deyilirdi: "Bu bədbəxtlər ağlagəlməz ehtiyac içindədirlər. Onlar o dərəcədə məhrumiyyətlərə düçar olmuşlar ki, hətta kömək istəmək gücündə də deyillər. Lakin kənardan kömək olmazsa onları qarşısı alınmaz fəlakət gözləyir. Əsasən taxıl əkinçiliyi ilə məşğul olan əhali işlək mal–qaradan, əmək alətlərindən və səpin üçün toxumdan məhrum olmuşlar. Elə kəndlər var ki, bir dənə inəyi, bir dənə toyuğu belə yoxdur... Aclıq və soyuqdan əmələ gələn xəstəliklər hər gün onlarla insanı məhv edir. Şübhəsiz, proqramında xalqın rifahının yaxşılaşdırılmasını əsas götürən bizim hökumətimiz daha çox ziyan çəkmiş, bədbəxtliyə düçar olmuş Şamaxı qəzasının əhalisinə kömək edəcək. Lakin bu kömək hər bir vətəndaşı, xüsusilə də hər bir müsəlmanı ölüm təhlükəsi ilə üzləşmiş tarixi ənənəsi olan Şirvan əhalisinə kömək əlini uzatmaq kimi mənəvi borcdan və vətəndaş öhdəliklərindən azad etmir. Müsəlman vətəndaşlar, Şirvanın ölüm

təhlükəsi altında olan əhalisini xilas edin!"

Bu müraciətdən sonra vəziyyətin ağır olmasına baxmayaraq, hökumətlə yanaşı Azərbaycanın müxtəlif bölgələrinin Şamaxı əhalisinə diqqət və qayğısı artmışdı.

Əlamətdar hal ondan ibarətdir ki, 1918–ci il hadisələri bədii ədəbiyyatda da öz əksini tapmışdır. Üzeyir Hacıbəyov, Məhəmməd Hadi, Mirzə Bala Məhəmmədzadə, İbrahim Xəlil və digər sənətkarlar bu mövzuda müxtəlif əsərlər yazmışdılar. Bu əsərlər içərisində Cəfər Cabbarlının şamaxılı iki gəncin faciəsindən bəhs edən "Əhməd və Qumru" hekayəsi diqqəti özünə cəlb edir. Hekayə şamaxılı iki gəncin-Əhməd və Qumrunun saf və ülvi məhəbbətindən, mart faciəsinin bu günahsız şəxslərə gətirdiyi müsibətlərdən bəhs edir. Əsərdə valideynləri erməni quldurları tərəfindən qətlə yetirilmiş, evləri dağıdılmış Əhməd və Qumru "Böyük pəncərələri qara kömürlərə dönmüş, altun divarları matəmlərə bürünmüş", "əti tökülmüş baş skeletinə bənzəyən möhtəşəm" İsmailiyyə binasının önündə dilənçi vəziyyətində qarşılaşırlar. Faciə və məhrumiyyətlərin məngənəsində tanınmaz hala düşmüş, "Yaralıyam, şikəstəm, Şamaxı əsiriyəm",- yalvarışlarından bir-birini çətinliklə tanıyan iki sevgili görüşlərinə sevinsələr də, bir-birini qucaqlamırlar, daha doğrusu, qucaqlaya bilmirlər. Çünki erməni vəhşilər onların qollarını kəsmişdilər. (44)

Fövqəladə İstintaq Komissiyası Şamaxı şəhərində törədilən cinayətlərdə əslən Şamaxıdan olub Bakı şəhərində yaşayan Stepan Lalayevin, Şamaxı şəhərinin sakinləri Qavril Karaoğlanovun, Arşak Gülbəndiyanın, Mixail Arzumanovun, Karapet Karamanovun, Armenak Martirosyantsın, Aleksandr Xaçaturovun, Mixail Xaçaturovun və başqalarının, cəmi 31 nəfərin Şamaxı qırğınlarının başlıca caniləri olduqlarını faktlarla sübut etmişdi.

Komissiyanın Şamaxı şəhəri və ona qonşu olan kəndlərdə ermənilər tərəfindən törədilən soyqırım hadisələri haqqında topladığı 7 cild, 925 səhifədən ibarət araşdırma materialları ermənilərin cinayətlərinin ifşasında mühüm əhəmiyyət kəsb edir.

Fövqəladə İstintaq Komissiyası Şamaxı ilə yanaşı Kürdəmir və Göyçay qəzasının Cəngi, Qaravəlli, Qarabucaq, Musafalı, Xəlil-Qasımbəy, Ərəb-Mehdibəyli kəndlərində, Sultanov və Sadalı malikanələrində ermənilərin törətdikləri vəhşilikləri də tədqiq etmişdir. Tədqiqatlar nəticəsində məlum olmuşdur ki, ermənilər Kürdəmirdə 56 evi, 127 ayrıca malikanəni, 2 məscidi, "Quran"ın təfsirinə dair zəngin kitabxananı yandırmışlar. (45)

Azərbaycan nümayəndə heyəti Paris sülh konfransında Fövqəladə İstintaq Komissiyasının materiallarının bir hissəsindən istifadə etmişdir. Bundan başqa Komissiyanın materiallarının bir qismi 1919–cu ildə, İstanbulda 73 səhifəlik "Müsəlman əhaliyə qarşı erməni vəhşiliyi haqqında sənədlər" məcmuəsində fransız dilində nəşr olunmuşdur. Bütün bunlar baş vermiş cinayətlərin beynəlxalq aləmə çatdırmasında ilk cəhdlər olsa da o zaman üçün böyük əhəmiyyət kəsb edirdi.

Paris Sülh konfransında Azərbaycan nümayəndə heyətinin rəhbəri Ə. Topçubaşov ABŞ prezidenti V. Vilsona 28 may 1919-cu il tarixli müraciətində ona digər sənədlərlə yanaşı, Fövqəladə İstintaq Komissiyasının materiallarını da təqdim etmişdi. Bundan sonra obyektiv informasiya toplamaq üçün Cənubi Qafqaza ABŞ nümayəndə heyətinin göndərilməsi məqsədəuyğun sayılmışdı. 1919-cu ilin yayında ABŞ tərəfindən Bakıya göndərilən general Harbord hadisələr barədə obyektiv məlumatlar toplamaq üçün müxtəlif şəxslərlə görüşmüşdü. Ermənilərin nümayəndəsi yepiskop Baqrat riyakarlıq edərərək ermənilərin mart hadisələrində

iştirakını inkar etməyə cəhd etmişdir. Ümumiyyətlə, Bakıda fəaliyyət göstərən rus və erməni təşkilatları Fövqəladə İstintaq Komissiyasının normal işinə müxtəlif manelər törətməklə yanaşı təzyiq kampaniyaları da təşkil etmişlər. Lakin bütün çətinliklərə baxmayaraq, komissiya qısa müddətdə çox böyük işlər görə bilmişdi.

Fövqəladə İstintaq Komissiyasının fəaliyyət göstərdiyi il yarım ərzində müxtəlif siyasi və millətçi partiyaların bayrağı altında fəaliyyət göstərən ermənilər tərəfindən Cənubi Qafqaz ərazisində müsəlman əhaliyə qarşı törədilmiş cinayətlər barədə 35 cildlik, 3500 cəhifəlik materiallar toplanmışdı. Bunların əsasında 128 məruzə hazırlanmış və 194 nəfər barədə cinayət işi qaldırılmış, bundan əlavə minlərlə cinayətkarın adları dəqiqləşdirilmişdi. Komissiya həmçinin Parisdəki Azərbaycan nümayəndə heyətinə göndərmək üçün 95 foto şəkildən ibarət 6 cildlik əlavə material və 80 diapozitiv hazırlamışdı.

Lakin təəssüf ki, Azərbaycanın müstəqilliyinin de-fakto tanınmasından (11 yanvar 1920–ci il) dərhal sonra qərb ölkələrinin təzyiqi ilə Azərbaycan Xalq Cümhuriyyəti Parlamentinin 2 fevral 1920–ci il tarixdə qəbul etdiyi aministiya haqqında qanun 1918–ci il soyqırım hadisəsi ilə bağlı məsuliyyətə cəlb olunmuş cinayətkarların cəzalandırılmasının qarşısını aldı. Qanunun 2-ci maddəsi ilə "milli düşmənçilik zəminində baş vermiş cinayətlərə görə məsulyyətə cəlb olunanlar" təqibdən və cəzadan azad olunur, 10-cu maddəyə görə isə Fövqəladə İstintaq Komissiyasının araşdırması nəticəsində qaldırılmış bütün cinayət işlərinə həmişəlik xitam verilirdi. Fövqəladə İstintaq Komissiyası çox böyük çətinliklər bahasına cinayətkarların çüzi hissəsi, 194 nəfərinə cinayət işi qaldırsa da, amnistiya qanununun qəbulundan son-

ra onların hamısı sərbəst buraxılmışdı. Pul kompensasiyası ilə zaminə buraxılmışların hətta pulları da geri qaytarılmışdı. Lakin Şamaxıda qanlı cinayətlərə başçılıq etmiş Stepan Lalayev cəzadan qurtara bilməmiş, öz əcəli ilə olsa da həbsxana divarları arasında ölmüşdü. (46)

Şamaxı soyqırımı ilə bağlı faktlar beynəlxalq aləmdə terrorizmə qarşı mübarizə aparıldığı hazırki vaxtda mühüm aktuallıq kəsb edir. Buna görə də bu faktlar obyektiv şəkildə yenidən araşdırılmalı və Şamaxı soyqırımı ilə bağlı həqiqətlər beynəlxalq aləmə çatdırılmalıdır.

# Nəticə

Hazırda 1918–ci il soyqırımının tədqiqi və beynəlxalq aləmə çatdırılması sahəsində mühüm işlər görülməkdədir. Bəzi erməni və rus müəlliflərinin öz yazılarında (47) azərbaycanlılara qarşı törədilmiş 1918–ci il soyqırım hadisələrini saxtalaşdırmağa, beynəlxalq ictimaiyyəti çaşdırmağa cəhdlər etməsi bu işin daim diqqət mərkəzində saxlanılmasını zəruri edir. Rus müəllifləri tarixi saxtalaşdırmaq üçün, Kiyev Rus dövlətinin knyazı ilə Şamaxı hökmdarının qızı arsında məhəbbətdəb bəhs edən, uydurma "Üç pəhləvan və Şamaxı çariçası" kimi cizgi filmləri çəkməkdən belə çəkinmirlər. Təəssüfləndirici hal ondan ibarətdir ki, 1918–ci il hadisələrinə dövlət səviyyəsində siyasi qiymət verildikdən sonra belə özünü kommunist adlandıran bəzi üzdəniraq şəxslər 1918–1920–ci illərdə düşmənə xidmət göstərmiş sələflərinin səhvlərini təkrar etməklə düşmənin dəyirmanına su tökməkdə davam edirlər. Onlar "1917-ci il və Azərbaycan" adlı kitab yazmaqla, www.kommunist.az veb saytına müxtəlif saxta materiallar qoymaqla ictimai rəyi çaşdırmağa çalışırlar. Bu şəxslər 1918–ci il hadisələri ilə bağlı sovet dövründə yazılan saxta fikirləri yenidən gündəmə gətirməyə, minlərlə dinc azərbaycanlını qətlə yetirmiş cinayətkarları müdafiə etməyə uğursuz cəhdlər edirlər. Onlar bununla mənsub olduqları xalqa xəyanət ediklərinin fərqinə belə varmırlar.

Beynəlxalq aləmdə bu cür cəhdlərin olması 1918–ci il hadisələri ilə bağlı araşdırma işlərinin daha da genişləndirilməsini zəruri edir.

Son illərin tədqiqatları nəticəsində bu sahədə yeni faktların ortaya çıxması cinayətkarların ifşasında mühüm əhəmiyyətə malikdir. Bu cür yeni faktlara misal olaraq Quba şəhərində 2007-ci ildə

şəhər stadionunda tikinti işləri aparılarkən təsadüfən 1918–ci ilə aid kütləvi məzarlığın aşkara çıxarılmasını göstərmək olar. Şamaxı ərazisində də bu cür kütləvi məzarlıqların olması etimalı böyükdür. Zəngin tarixə malik Şamaxı ərazisində əsasən sovet dövründə arxeoloji qazıntılar aparılmış, bu qazıntıların istiqaməti fərqli olduğundan və 1918–ci il soyqırımına aid faktların toplanması kommunust rejiminin siyasəti ilə ziddiyyət təşkil etdiyindən o dövrə aid mənbələrdə belə məzarlıqların olması haqqında məlumata rast gəlinmir. Buna görə də 1918–ci il erməni vəhşiliklərinə aid yeni tarixi faktlar əldə etmək üçün müasir dövrdə keçmiş Şamaxı qəzası ərazisində arxeoloji qazıntıların genişləndirilməsinə ciddi ehtiyac var. Bəzi mülahizələrə görə, 1918-ci ildə erməni yaraqlıları tərəfindən qətlə yetirilmiş Şamaxı sakinləri Kələxana və Süleyman dərələrində dəfn edilib, gələcəkdə bu ərazilərdə arxeoloji qazıntılar zamanı yeni kütləvi məzarlıqların tapılması istisna deyil.

Müasir dövr tədqiqatları sübut edir ki, 1918–ci il qırğınlarında ermənilər müsəlman əhali ilə yanaşı, yəhudilərə, almanlara və digər milli azlıqlara qarşı da cinayətlər törətmişlər. Bu dövrdə ermənilər tərəfindən 3 minə qədər yəhudinin həyatına son qoyulub. Quba Rayon İcra Hakimiyyətinin Qırmızı qəsəbə inzibati ərazi vahidliyi üzrə nümayəndəsi yəhudi İsakov Pisax Davidoviç 1918-ci ildə ermənilərin Azərbaycanın müxtəlif bölgələrində qırğınlar və talanlar törədərkən qətlə yetirdikləri dağ yəhudilərindən 104 nəfərinin, o cümlədən Qırmızı qəsəbə sakinləri olan 18 nəfər yəhudinin siyahısını prokurorluğa təqdim edib. O zaman erməni Amazaspın rəhbərliyi ilə qətlə yetirilən yəhudilər Şimi dərəsinə atılmışlar. (48)

1918-ci ildə Qafqaz bölgəsində olan alman qüvvələrinin baş komandanı baron Qres Kremsenştaynın "Mənim Qafqaz missiyam" adlı kitabındakı xatirələrindən məlum olur ki, 1918-ci ilin dekabrında ermənilər Borçalıdakı Yekaterinfeld kəndi ərazisində

400-dək dinc alman əhalini də heç bir səbəb olmadan öldürüb və kəndin qırağındakı quyuda basdırıblar. (49)

Hazırda Respublikanın əksər yaşayış məntəqələrində, o cümlədən Şamaxıda 1918–ci il soyqırım abidələrinin qoyulması və bu sahədə təbliğat işlərinin aparılması müsbət qiymətləndirilməlidir. Türkiyənin nüfuzlu "A" telekanalı 1918-ci ilin mart günlərində bolşevik-erməni qoşun birləşmələrinin Azərbaycanda həyata keçirdiyi soyqırımına dair 3 bölümdən ibarət filmin çəkilişinə başlaması da görülən müsbət işlərdəndir. (50) Lakin bu sahədə işlərin daha da gücləndirilməsinə ehtiyac var.

Tədqiqatlar sübut edir ki, 1918–ci ildə Azərbaycanın demək olar ki, əksər bölgələrində ermənilər qırğınlar törətmişlər. Bunların bir hissəsi araşdırılsa da bir çoxu hələ də öyrənilməmişdir. Buna görə də gələcəkdə Bakı, Şamaxı, Quba, Zəngəzur, Qarabağ, Naxçıvanla yanaşı Kürdəmir, Göyçay, Hacıqabul, Salyan, Neftçala kimi nisbətən az tədqiq olunmuş və ümumiyyətlə tədqiq olunmamış ərazilərdə ermənilərin törətdiyi cinayətlərin araşdırılmasına ciddi ehtiyac var. Soyqırıma məruz qalan, lakin tədqiq olunmayan ərazilərə misal olaraq Neftçala rayonunun Tataraməhəllə, Uzunbabalı, Qaramanlı, Xıllı, Bankə və s. kəndlərini göstərmək olar. (51)

Sual oluna bilər ki, 1918–ci ildə Azərbaycanın müxtəlif bölgələrində nə qədər əhali soyqırımın qurbanı olmuşdur? Soyqırıma məruz qalanların dəqiq sayı barədə məlumatlar varmı?

Britaniya briqada generalı R. Qortonun 8 dekabr 1918-ci il Londona göndərdiyi sənəddə 20 min, R. Mustafazadənin kitabında 20 min, A. Balayevin kitabında 30 min, Fövqəladə İstintaq Komissiyasının sənədlərində 30 min, Azərbaycan Respublikası Milli Məclisinin nəşr etdiyi kitabda isə 50 mindən çox müsəlmanın 1918–ci ildə soyqırıma məruz qaldığı göstərilir. (52) Lakin faktlar

sübut edir ki, gələcəkdə tədqiqatlar davam etdirilməklə daha çox insanın soyqırıma məruz qaldığınıs üzə çıxarmaq olar.

Ermənilərin bütün dövrlərdə, o cümlədən 1918–ci ildə azərbaycanlılara qarşı törətdikləri cinayətlər yəhudilərə qarşı 1933–1945-ci illərdə törədilmiş Xolokost cinayəti ilə eyniyyət təşkil edir. Ukraynadakı Xolokost Tarixini Araşdırma Mərkəzinin direktoru Anatoli Podolski azərbaycanlıların məruz qaldığı 1918–ci il soyqırımı haqqında demişdir: "Bu hadisələr ermənilərin əli ilə zorla sovet hakimiyyəti qurularkən baş verib. Bu gün bu haqda həqiqətləri yazmaq lazımdır." (53)

Maykl Smit "İtirilmişlər haqqında xatirə və Azərbaycan cəmiyyəti" əsərində qeyd edir ki, Azərbaycanın təqvimində üç matəm tarixi–31 mart–azərbaycanlıların genosid günü, 26 fevral Xocalıda "Xolokost" günü və 20 yanvar–Qara yanvar qurbanlarının anım günü mövcuddur.

Bu faciələr əsasən tarixi unutqanlığın nəticəsində baş vermişdir. Tarixini unudan xalqın tarixi təkrar olunur. Əgər 70 il kommunist rejimi dövründə bilərəkdən saxta tarix vasitəsilə Azərbaycan xalqının yaddaşından 1918–ci il müsibətləri silinməsəydi, 1918–ci il mart qırğınlarında öldürülən minlərlə dinc sakinin dəfn olunduğu yerdə S.M.Kirovun adına istirahət parkı salınmasaydı 1990–cı ilin 20 yanvar, 1992–ci ilin 26 fevral Xocalı faciəsi və digər faciələr baş verməzdi. 1918- ci ildə Bakı, Şamaxı, Quba və digər ərazilərdə məcburi köçkünə çevrilən insanların taleyinə biganə qalmasaydıq, bu gün 1 milyondan artıq qaçqın və məcburi köçkünün problemi ilə üz- üzə qalmazdıq.

Gələcəkdə yeni faciələrin baş verməməsi və təhlükələrin qarşısının vaxtında alınması üçün tarix obyektiv şəkildə dərindən öyrənilməli və ondan ibrət götürülməlidir.

# İstifadə olunmuş ədəbiyyat

1. Azərbaycan tarixi. 3 cilddə, III c., Bakı: Elm, 1973, ş. 147

2. Bünyadov Z. Əfsanə və əfsanə yaradanlar. “Azərbaycan” qəzeti, 6 noyabr 1989-cu il; Bir qədər Bakı və Bakı komissarları haqqında “Tarix” qəzeti 15 noyabr 1990, Bir daha uydurma 26 rəqəmi haqqında “Tarix” qəzeti 10 aprel 1992; Azərbaycan xalqına qarşı 1918-ci il mart soyqırımı : 3 cilddə Sənədlər toplusu.I cild : “26 Bakı komissarları” nın əsl tarixi Bakı: Çaşıoğlu, 2009.-776s.; Zülfüqarlı M.P. 26-lar xalqımıza düşmən idilər. “Haray “qəz., 22 aprel 1992; M. Əzizbəyovun xalq əleyhinə fəaliyyətinə aid yeni faktlar. “Ədalət” qəz. 06. 10. 2004; Tariximizin daha bir saxtalaşdırılmış səhifəsi–Bakı Kommunası. “Salam”qəz. 05.05.2007;

3. Zülfüqarlı M. P. Sovet dövrünün heykəlləri. Caparidze Prokofi Aprasionoviç (təxəllüsü Alyoşa) (1880-1918). “Ədalət” qəzeti 03.11. 2004; Maştağada abidəsi ucaldılmış M. Məmmədyarov kimdir? “Ədalət” 02. 10. 2004; Sovet dövrünün hekəlləri. Qəzənfər Mahmud oğlu Musabəyov (1888 -1938) “Ədalət” 21. 10. 2004; Sovet dövrünün hekəlləri. Ruhulla Əli oğlu Axundov. “Ədalət” qəzeti 11.11. 2004; Sovet dövrünün heykəlləri. Ayna Sultanova.“525-ci qəzet”16. 04. 2009; Məşədi Əzizbəyov..“525-ci qəzet” 24. 04. 2009 və s.

4. Əziz.Ə. “Azadlıq Naminə” Bakı 2000, s. 157-158; “Həftə içi” qəz. 28 iyul 2009.

5. Azərbaycan Respublıkası prezidenti Heydər Əliyevin “Azərbaycanlıların soyqırımı haqqında” fərmanı. Azərbaycan qəzeti, 26 mart 1998-ci il.

6. Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin 31 Mart Azərbaycanlıların Soyqırımı Günü münasibətilə Azərbaycan

xalqına müraciəti. Azərbaycan qəzeti, 29 mart 2008-ci il

7. Axundzadə Seyid Ağa. Mart hadisəsi 1918 və yaxud Nuru Paşa tərəfindən Bakının işğalı. Bakı 1919; İsmayılov R. Azərbaycan tarixi Bakı 1923; Rəsulzadə M.Ə. Azərbaycan Cümhuriyyəti. Bakı: Elm, 1990; Величко В. Л. Кавказ. Русское дело и междуплеменные вопросы. Баку, 1990; Ordubadi M. S. Qanlı sənələr. Bakı 1991; Zeynaloğlu C. Müxtəsər Azərbaycan tarixi.Bakı, 1992; Baykara Hüseyn Azərbaycan istiqlal mübarizəsi tarixindən. Bakı 1992; Məmmədzadə M.B. Milli Azərbaycan hərəkatı. Bakı: Nicat, 1992; Nəvvab M. M. 1905-1906-cı illərdə erməni-müsəlman davası. Bakı, 1993; Наджафов Б. Лицо Врага история армянского национализма в Закавказье в конце XIX–начале XX в. Часть первая. Баку: Элм, 1993; Часть вторая. Баку, Шарг-Гарб, 1994; V. Arzumanlı, V. Həbiboğlu, K. Muxtarov 1918-ci il qırğınları. Tarixi araşdırmalar. Bakı 1995; Məhərrəmov N. Daşnaksütyun və Azərbaycanın taleyi. Bakı: Azərbaycan, 1995, İsgəndərov A. 1918-ci il mart qırğınının tarixşünaslığı. Bakı: Mütərcim, 1997, 184 s.; Anar İsgəndərov Azərbaycanda türk-müsəlman soyqırımı probleminin tarixşünaslığı 1918-1920 Bakı“Adiloğlu” 2006; Мурадзаде М. Мартовские события. Баку, 1996; Abdullayev Ə. Ermənistanın Azərbaycana qarşı təcavüzkarlıq siyasəti (XIX əsrin axırı-XX əsr). Bakı, Elm, 1998, 322 s.; А. Балаев. Азербайджанское национальное движение в 1917-1918 гг. Баку, 1998; Балаев А. Февральская революция и национальные окраины. Мартовские события 1918 г. в Азербайджане. Москва, 2008; Геноцид азербайджанцев в 1918-1920 гг. Документы и материалы. Баку, 2001; А.Халилов. Геноцид против мусульманского населения Закавказья в исторических источниках. Баку, 2000; Геноцид азербайджанцев в 1918-1920 гг. Документы и материалы. Баку, 2001; Abışov V.Ş. Azərbaycanlıların soyqırımı. 1918-1920-ci illər. Bakı: Qartal, 2001; Azerbaycan Belgelerinde Ermeni sorusu (1918-

1920). Ankara: Başbakanlık Devlet Arşnvleti Genel Müdürlüğü, 2001, 682 s.; Qəniyev S. H. 1918-ci il Şamaxı soyqırımı Bakı : Nurlar NPM, 2003; Рустамова-Тогиди Солмаз Али кызы. «Март 1918 г. Баку. Азербайджанские погромы в документах»Баку, 2009, 864 стр; Рустамова-Тогиди Солмаз Али кызы.«Куба. Апрель-май 1918 г. Мусульманские погромы в документах» Баку. 2010. 552 стр. Казымзаде Ф. Борьба за Закавказье (1917-1921). Литературный Азербайджан, 1993, № 1-3, с. 29; Xaqani İsmayıl «Azəri soyqırımı» Bakı 2007; Eldar Əzizov Difai. XX əsrin əvvəllərində erməni–azərbaycanlı münaqişəsinin ilkin tarixi şərtləri və səbəbləri. Bakı 2009; Paşayev A. Açılmamış səhifələrin izi ilə. Bakı: Azərbaycan nəşriyyatı, 2001.-536 s.; Paşayev A.Ə. XIX-XX əsrlərdə ermənilərin Azərbaycanlılara qarşı törətdikləri soyqırımları və deportasiyalar: tarix elm. dok.... dis. avtoreferatı Bakı 2007; Казымзаде Ф. Борьба за Закавказье (1917-1921). Литературный Азербайджан, 1993, №№ 1-3, с. 29; Rəsulzadə M. Ə. Unudulmaz faciə. "Azərbaycan" qəzeti, 31 mart 1919; Mart hadiseyi-ələmiyyəsinin müxtəsər tarixçəsi. "Azərbaycan" qəzeti, 31 mart 1919; Paşayev A. Şamaxıda erməni vəhşilikləri. "Xalq qəzeti" 30 mart 2010; Paşayev A. İngilis jurnalist Skotland-Liddell erməni məkri haqqında. "Xalq qəzeti" 12 mart 2010; Müznib Ə. Bakıda millət qırğını. "Tarix" qəzeti № 1 1990; Həsənli C. 1918–ci ilin martı: vətəndaş müharibəsi, yoxsa türk–müsəlman soyqırımı? "Azadıq" qəzeti, 31 mart 1994; Zülfüqarlı M.P. Bakının"Varfolemey" dəhşətləri. Millət qəz. 17 mart 2003; Mart qırğının ibrət dərsləri (1918-2005). "Ədalət" 24.03.05; Mirzəbəyli İ. 1918-ci il soyqırımı Şamaxıda daha qəddarlıqla icra edilmişdi. Xalq qəzeti. -31 mart 2005; Rzayeva R. 1918-ci il soyqırımının qanlı səhifələri. Xalq qəzeti. -27 mart 2007; Talışlı H. M. Lənkəranda 1918-ci il soyqırımı. "Respublika" qəz., 29 mart 2007; Məmmədov X. Bakıda 1918-ci ildə ermənilərin törətdikləri mart soyqırımı. Respublika.-31 mart 2007; İmanov V.

Arxivlərdə azərbaycanlıların soyqırımını təsdiq edən yetərincə sənəd var. Xalq qəzeti.-1 aprel 2007;

8. Денстервилль (Генерал майор). Британский империализм в Баку и Персии. 1917-1918. Воспоминания. (Пер.с англ. Руденко). Тифлис: Совет. Кавказа, 1925, 281 с.; Kazimzadeh F. The Struggle for Transjaujasus (1917-1921). New York, 1951; Swietijhovski T. Russia and Azerbaican: Borderland in Transition, New York, 1955; Swietijhovski Tadeusz, Brian Collins. Historijal Dijtionary of Azerbaican. London, 1999; Suny R. The Baku Commune, 1917-1918. Class and Nationality in the Russian Revolution. Prinjeton, 1972; Alstadt Andrey. The Azerbaicani Turks: Power and İdentity under Russian Rule. Stanford, 1992. Маккарти Дж., Маккарти К. Тюрки и Армяне. Баку: Азернешр, 1996, 158с. Смит М. Память об утратах и азербайджанское общество. 2000 və s.

9. Azərbaycan tarixi. Ən qədim zamanlardan XX əsrədək. Bakı 1994, s.280

10. Azərbaycan tarixi. Uzaq keçmişdən 1870–ci ilə qədər. Bakı 1996, s.213, 468, 474, 553-554

11. Вердиева Х., Гусейнзаде Р. «Родословная» армян и их миграция на Кавказ с Балкан., Баку, 2003 с.78

12. Шавров Н.Н. Новая угроза русскому делу в Закавказье: предстоящая

распродажа Мугани инородцам. Баку: Элм, 1990, s. 64

13. Xəlilli F. Şamaxı tarix–diyarşünaslıq muzeyi. Bakı–2009 s. 135- 136

14. Маевский В.Ф. Армяно-татарская смута на Кавказе как один из фазисов армянского вопроса. Баку, 1993 с. с. 29.

15. Üzeyir Hacıbəyov. Seçilmiş əsərləri.Bakı 1985, s.73, 615; “İrşad” qəzeti 7 mart 1907.

16. Rəsulzadə M.Ə. Çağdaş Azərbaycan tarixi. Bakı, Gənclik,

1991, s. 2.
17. “Mart qırğını”. “Azərbaycan” qəzetinin xüsusi buraxılışı. № 11, mart 1993.
18. Азербайджанская Демократическая Республика. Архивные документы Великобритании. Баку, 2008, s. 183.
19. Paşayev A. Açılmamış səhifələrin izi ilə.Bakı, 2001, s. 228
20. Азербайджанская Демократическая Республика. Архивные документы Великобритании. Баку, 2008, с.178.
21. İsgəndərov A. 1918-ci il mart qırğınının tarixşünaslığı. Bakı: Mütərcim, 1997, s.110-111.
22. “Коммунист” (Ереван), 26 августа 1989, №199.
23. «Известия Кавк. Краев. Центра Сов. Рабоч., Солд. и крест. Деп. И Тифл. Совета рабоч. и солд. Деп»., разные годы. №72, 1918; Abışov V.Ş. Azərbaycanlıların soyqırımı. 1918-1920-ci illər. Bakı: Qartal, 2001, s. 106.
24. Токаржевский Е.А. Из истории иностранной интервенции и гражданской войны в Азербайджане. Баку: Изд-во Акад. наук Аз. ССР, 1957, с.55.
25. Qafqazda Sovet totalitarizmi (20-30 -cu illər). Elmi konfransın materialları. Xəzər Universiteti 6-7 noyabr 1998.Bakı,1998, s.18-20.
26. Bünyadov Z.M. “Qırmızı terror” Bakı 1993, s. 3
27. Газета «Азербайджан», 1918 года, 21 октября.
28. Сеидов М. Г. Армянский Вандализм.-Новосибирск.–2010, с.100 (azərbaycan, rus və ingilis dillərində)
29. Quliyev D.P. Tarix şahiddir ki. 1918-1920-ci illərin hadisələri bu günün gözü 151ilə: faktlar və şərhlər. Həyat, Bakı, 1992, 22 may, №100; ЦГАОР АзССР, ф. 261, оп. 1, д. 105, л. 102-103.
30.Tariximizin faciəli səhifələri:soyqırım. (azərbaycan və ingilis dillərində) Azərbaycan Respublikası Milli Məclisinin nəşri. Bakı 2000,s.21.
31. Bax: Рустамова-Тогиди Солмаз Али кызы. Куба. Апрель-

май 1918 г. Мусульманские погромы в документах. Баку, 2010, s. 64; Paşayev A. Açılmamış səhifələrin izi ilə.Bakı, 2001, s.229; İsgəndərov A. 1918-1920-ci illər türk-müsəlman soyqırımları. "Azərbaycan", 31.03.2009; Qəniyev S. H. 1918-ci il Şamaxı soyqırımı. Bakı, 2003, s.135-136; Данные архивных материалов о зверствах армян в Шемахинском уезде (1918 г.). ARDA, f. 1061, siy. 2, iş 85, 87, 100; iş. №3, f.1061, s..1; f. 1061, siy. 1, iş. 11, v.65

32. Bax: Azərbaycan Respublikası Prezidentinin İşlər İdarəsi Prezident kitabxanası. Azərbaycanlıların soyqırımı və deportasiyası. Bakı 2010,s. 86-87;

33. Bax: Qəniyev S. H. 1918-ci il Şamaxı soyqırımı. Bakı, 2003, s.67-68; www.shamaxi-mks.az

34. Paşayev A. Açılmamış səhifələrin izi ilə.Bakı, 2001, s.229; (Bax: ARDA. f. 1061, siy. 1, iş 100, vər. 19-24).

35. Arzumanlı V., Həbiboğlu V., Muxtarov K. 1918-ci il qırğınları. Tarixi araşdırmalar. Bakı1995, s. 21-34.

36. "Новый Восток", 1922, ч.3, с.184; F.Q.Köçərli. Qarabağ. Bakı, 2002, s.128; Elçin Qaliboğlu "Ermənilər Azərbaycanın Güneyində də soydaşlarımıza qarşı soyqırımı törətmişdilər". "Xalq Cəbhəsi" 31 mart 2009

37. Горянин А., Севастьянов А. Русскому об Азербайджане и Азербайджанцам. Москва, 2009, с.23; Abışov V. Ş. Azərbaycanlıların soyqırımı. 1918-1920-ci illər. Bakı: Qartal, 2001, s.128.

38. Süleymanov M. Qafqaz İslam Ordusu. Bakı 2000, s. 324, Yuceer N. Qafqaz İslam Ordusunun Bakı şəhərini azad etməsi.2008, s. 333

39. Рустамова-Тогиди С.Этого забыть нельзя. «Зерколо» газ.30 марта 2008

40. Zülfüqarlı M. P. Azərbaycanı kimlər idarə edib? (may 1918–oktyabr 2003). Bakı 2006, s.28

41. “Odlar yurdu” qəzeti 8-9 aprel, 1990-cı il

42. İstiqlal qəz. (Münhen) 1 aprel 1933, № 31

43. Rəsulzadə M.Ə. Azərbaycan Cümhuriyyəti. Bakı: Elm, 1990, s. 37

44. Rüstəmli A. “Azərbaycanlıların soyqırımı bədii ədəbiyyatda (Mart, 1918) ”

Bizim Əsr qəz. 01 aprel 2003.

45. Абдулбагиева С. Мартовский геноцид1918 г. Бакинский рабочий газ. 30 марта 2010.

46. Рустамова-Тогиди С. Этого забыть нельзя. «Зерколо» газ.30 марта 2008

47. Гончаров М. С. Армяне и молокане в Шемахинских событиях 18г.2009; Смольников Т. Н. Ответ на статью «ЭТОГО ЗАБЫТЬ НЕЛЬЗЯ» д.и.н. Солмаз Рустамовой-Тогиди, опубликованную в газете “Зеркало” 30 марта 2008. www.molakans.ru; Ишханян Б. “Великие ужасы Баку. Анкетное исследование сентябрьских событий 1918г.”, изданно 1920г. на армянском и русском языках, Манасян А. Карабахский конфликт, Ереван, 1998; Дадаян Х. “Армяне и Баку. 1850-1920гг.” (Изд-во “Норaванк”), 2006; Акопян А. “Татоязычные армяне” (историческо-этнографическое исследование), диссертация на соискание ученной степени к.и.н., Ереван, 2002 (на арм.).

48. Kaspi qəz. 30.03.10; İlqar Səfərov. ANS PRESS. 22.04.2010

49. Həftə içi qəz. 19 noyabr 2010.

50. Azəri soyqırımı...və Neftçala hadisələri.“31 Mart Azərbaycanlıların Soyqırımı günü” ilə əlaqədar tövsiyə-biblioqrafik göstərici. Neftçala rayon mərkəzləşdirilmiş kitabxana sistemi. Metodika-Biblioqrafiya şöbəsi 2009

51. Azərbaycan qəz., 03 fevral 2010.

52. Tariximizin faciəli səhifələri:soyqırım. (azərbaycan və ingilis dillərində) Azərbaycan Respublikası Milli Məclisinin nəşri.

Bakı 2000,10 -11, Гасанлы Д. Трагическая весна. Зеркало газ. 9 мая 2009 г.; Доклад генерала Р.Гортона о ситуации в Азербайджане. 08.12.1918 г. Азербайджанская Демократическая Республика. Архивные документы Великобритании, с.83; Р.Мустафазаде. Две республики. Азербайджано-российские отношения в 1918-1922 гг. М., 2006. с.29; А.Балаев. Февральская революция и национальные окраины. Мартовские события 1918 года в Азербайджане. М., 2008, с.47; См: Фонд Чрезвычайной следственной комиссии при Министерстве юстиции Азербайджанской Демократической Республики.// ГААР, ф.1061; Фонд Азербайджанской Демократической Республики.// ГАППОД УДП АР, фонд 277

53. APA -26 iyul 2010-cu il.

Project manager **Elkhan Suleymanov,** the president of the Association for Civil Society Development in Azerbaijan, Deputy of Shamakhi

Author **Maharram Zulfugarli,** Doctor of philosophy in historical sciences

Scientific Editor **Karim Shukurov**, Professor, Doctor of historical sciences

Editorial staff

**Fuad Babayev**
**Tarana Babayeva**
**Shahin Jamalov**
**Vali Alibayov**
**Dayanat Musayev**
**Ramiz Sevdimaliyev**

Language editor

**Tural Ahmadov**

The book deals with the massacre committed by the armed Armenians in March-April of 1918 in Shamakhi. The prime objectives of Armenians, committing this crime with the assistance of the Baku Soviet, were to put Baku, rich in natural resources, under the control of the Soviet Russia by carrying out ethnic cleansing in Baku and in its suburbs.

# Table of contents

# Preface

More than 90 years Armenian diaspora has been disseminating-partial, most often wrong, and even distorted information to the world community. Recently, parliaments of some countries and communities have recognized or are currently recognizing the 1915 events as "genocide". Regretfully, Turkey remained silent until 15 years ago and assumed that this issue would not be brought to agenda by Armenians as time passes. Conversely, Armenian diaspora was and still is united in the U.S. and in other countries to this end, and thousands of people took this mission as the maintenance of their life. By keeping claims on the fabricated Armenian genocide in agenda, they set a goal to protect their nationalities in different countries on the one hand, and pursue their demand on compensation from Turkey and even territorial claims as a means of pressure, on the other.

Dissemination of biased information in print and online media by Armenian diaspora in over 90 years has indeed yielded certain results, thus partial and distorted claims have gradually been accepted as a mere truth in several countries.

The prime reason for bringing the 1915 events to the attention of the world community and to the agenda of parliaments of some countries by Armenia and Armenian diaspora is that they make endeavor to keep the occupation of Azerbaijani territories by Russian ammunition 19 years ago, more than a million of refugees and IDPs and eventually Nagorno-Karabakh problem out of attention. This strategy is implemented meticulously and discreetly.

Evidently, Armenia and Armenian diaspora make an attempt to distract views on the massacre carried out against Azerbaijani Turks in March-April of 1918and on the massacre against 630 civili-

